"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

# Dünya azərbaycanlılarının lideri

**TÜRK DÖVLƏTLƏRİ** TƏŞKİLATININ ÜZVLƏRİ OLAN ÖLKƏLƏRDƏN




**KƏNARDA YAŞAYAN SOYDAŞLARIMIZIN**

- **hüquqlarının, təhlükəsizliyinin, milli kimliyinin qorunması,** onların assimilyasiyaya uğramaması kimi məsələləri artıq təşkilat çərçivəsində daimi əsasda diqqətdə saxlamağın vaxtı gəlib çatmışdır.
- **Onların öz ana dilində təhsil almaları daim təşkilatın gündəliyində olmalıdır.** Bu istiqamətdə lazımi addımlar atılmalıdır.

AZƏRBAYCAN DÖVLƏTİ **XARİCİ ÖLKƏLƏRDƏ YAŞAYAN**




**AZƏRBAYCANLILARIN HÜQUQ VƏ AZADLIĞININ, TƏHLÜKƏSİZLİYİNİN TƏMİN EDİLMƏSİNƏ XÜSUSİ DİQQƏT YETİRİR.**

✓ Biz acı taleyin hökmü ilə Azərbaycan dövlətindən ayrı düşmüş soydaşlarımızın dilimizi, ənənələrimizi, mədəniyyətimizi qoruyub saxlamaları, azərbaycançılıq ideyalarına sadiq olmaları, **öz tarixi Vətənləri ilə əlaqələrin heç vaxt kəsilməməsi üçün səylərimizi davam etdirəcəyik.**




ADPU-DA ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN 100 İLLİK YUBİLEYİ İLƏ BAĞLI TƏDBİRLƏR PLANI TƏSDİQ OLUNUB — 2 SƏH.
GÖRKƏMLİ ALİM HƏSƏN MİRZƏYEVİN 95 İLLİYİNƏ HƏSR OLUNAN BEYNƏLXALQ KONFRANS — 2 SƏH.
İRƏVAN MÜƏLLİMLƏR SEMİNARİYASININ 140 İLLİYİNƏ HƏSR OLUNAN KİTABIN TƏQDİMATI — 4 SƏH.
ŞƏHİD MİLLİ QƏHRƏMAN ŞÜKÜR HƏMİDOVUN TƏLƏBƏ QIZI İLƏ MÜSAHİBƏ — 5 SƏH.
UNİVERSİTETİMİZ ZƏFƏR GÜNÜNÜ COŞĞU İLƏ QEYD EDİR — 6 SƏH.
TÜRKİYƏ UNİVERSİTETLƏRİ İLƏ QARŞILIQLI ƏLAQƏLƏR GENİŞLƏNDİRİLİR — 8 SƏH.
TÜRK DÜNYASININ ALİ TƏHSİL OCAQLARI İLƏ ƏLAQƏLƏR İNKİŞAF EDİR — 10 SƏH.
ƏHMƏD CAVAD - 130 — 12 SƏH.

*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Oktyabr - Noyabr, 2022 / № 7 (1117)

## ADPU-DA ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN 100 İLLİK YUBİLEYİ İLƏ BAĞLI TƏDBİRLƏR PLANI TƏSDİQ OLUNUB





Noyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib.

Elmi Şuranın sədri, ADPU-nun rektoru professor Cəfər Cəfərov çıxış edərək Pedaqoji Universitetin növbəti strateji inkişaf planının hazırlanması, habelə, yeni hədəflər istiqamətində aparılan ardıcıl fəaliyyət haqqında məlumat verərək, tədris prosesinə istedadlı və ixtisaslı gənc kadrların cəlb olunması, universitetdaxili, digər tərəfdaş və maraqlı qurumlar, habelə müxtəlif layihələr üzrə ümumrespublika müntəzəm təlim proqramlarının həyata keçirilməsini diqqətə çatdırıb. Rektor bildirib ki, Universitetin ikinci yüzillik strategiyasında hərtərəfli yenilənmə və rəqabətqabiliyyətlilik kimi meyarlar əsas alınacaqdır. Prof. C.Cəfərov deyib ki, göstərilən hədəflərə çatmaqda növbəti il keçiriləcək institusional akkreditasiyanın böyük önəmi var, bununla belə müvafiq strukturların müvafiq sahə üzrə beynəlxalq akkreditasiya proqramlarını tədqiq etmələri və müvafiq təkliflər paketi hazırlamaları tövsiyyə olunur.



Rektor Türkiyəyə işgüzar səfərini xatırladaraq, qeyd edib ki, ali təhsil müəssisəsinin inkişafında xarici əlaqələrin, xüsusən, qardaş Türkiyənin ali təhsil və tədqiqat müəssisələri ilə əlaqələrin genişləndirilməsi, ikili proqramların icrası mühüm əhəmiyyət kəsb edir.

Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov 2022/2023-cü tədris ilində ADPU-da keçiriləcək institusional akkreditasiya prosesinə hazırlıq barədə məruzə edərək, universitetin prosesdə yüksək səviyyədə təmsil olunaraq yeni imkanlar əldə edəcəyinə əminliyini ifadə edib. Sosial və humanitar məsələlər üzrə prorektor pfofessor Fikrət Rzayev isə Ümummilli lider Heydər Əliyevin 100 illik yubileyi ilə bağlı ADPU-nun Tədbirlər Planı haqqında məruzə edib. Şuranın iclası əməkdaşların yeni dərs vəsaitlərinin nəşrinin və tədrisə dair bir neçə məsələnin müzakirəsi ilə davam etdirilib. Yekunda Elmi Şura institusional akkreditasiya ilə bağlı təklif olunan tərkibdə Təşkilat Komissiyasının yaradılması və Ümummilli lider Heydər Əliyevin 100 illik yubileyi ilə bağlı ADPU-nun Tədbirlər Planının təsdiq edilməsi haqqında qərar qəbul edib.

## GÖRKƏMLİ ALİM HƏSƏN MİRZƏYEVİN 95 İLLİYİNƏ HƏSR OLUNAN BEYNƏLXALQ KONFRANS






Noyabrın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Şöhrət" ordenli, Əməkdar elm xadimi, görkəmli dilçi alim, professor Həsən Mirzəyevin 95 illik yubileyinə həsr olunmuş "Müasir Azərbaycan dilçiliyinin aktual problemləri" Beynəlxalq elmi konfransı öz işinə başlayıb.

İki gün davam edən Beynəlxalq konfransda canlı və onlayn formada Azərbaycan, Türkiyə, Özbəkistan, Qazaxıstan, Qırğızıstan, Hindistan, Gürcüstan və Nigeriyadan nümayəndələr iştirak edir.

Tədbirdə iştirak edən Milli Məclisin deputatları, Elm və Təhsil Nazirliyinin nümayəndələri, ali təhsil müəssisələrinin və tədqiqat institutlarının rəhbərləri, tanınmış elm və mədəniyyət xadimləri, xarici ölkələrdən gələn alimlər, eləcə də alimin yetirmələri əvvəlcə universitetin foyesində Həsən Mirzəyevə həsr edilmiş sərgiyə baxıblar.

ADPU ilə Türkiyənin İqtisadi İnkişaf və Sosial Araşdırmalar İnstitutunun (İKSAD) tərəfdaşlığı ilə təşkil olunan Beynəlxalq konfrans Azərbaycan və Türkiyənin dövlət himnlərinin səsləndirilməsi və şəhidlərin xatirələrinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.

Giriş sözü ilə çıxış edən Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov fədakar alimin həyat yolundan və elmi axtarışlarından söz açıb.

Sonra görkəmli alimin həyat və yaradıcılığından bəhs edən videoçarx nümayiş olunub.

Tədbirdə AMEA-nın prezidenti, akademik İsa Həbibbəyli, Milli Məclisin Elm və təhsil komitəsinin sədri Bəxtiyar Əliyev, millət vəkili Madər Musayev, Bakı Dövlət Universitetinin rektoru Elçin Babayev, Azərbaycan Dillər Universitetinin rektoru, akademik Kamal Abdulla, akademik Nizami Cəfərov, Bakı Ali Neft Məktəbinin rektoru Elmar Qasımov, Dilçilik İnstitutunun direktoru professor Nadir Məmmədli, Türkiyənin Qazi Universitetinin professoru Hülya Kasaboğlu, Fırat Universitetinin professoru Ahmet Buran, Özbəkistan Dövlət Şərqşünaslıq Universitetinin Türkologiya fakültəsinin dekanı dosent Cumali Şabanov və digər çıxış edənlər Azərbaycan dilçilik elminin tədqiqində, ümumən filologiya və türkologiya elmində dərin izlər buraxmış Həsən Mirzəyevin elmi əsərlərinin öz aktuallığı ilə bu gün də tələbələr, tədqiqatçılar, xüsusən də gənc alimlər üçün əsl mənbə olduğunu vurğulayıblar.

Çıxış edənlərdən Türkiyənin Kafkas Üniversiteti Çağdaş Türk Ləhçələri və Ədəbiyyatları Bölümünün dosenti İlkin Qulusoy magistrantı Səma Şahinlə bərabər hazırladıqları, professor Mahirə Hüseynovanın redaktoru olduğu Həsən Mirzəyevin 95 illiyinə ithaf olunmuş "Karşılaştırmalı deyimbilimi" ("Müqayisəli frazeologiya") əsərini konfrans iştirakçılarına təqdim edib. ADPU-nun Elmi-təşkilati şöbəsinin müdiri professor İbrahim Bayramov "Görkəmli dilçi alim professor Həsən Mirzəyev" mövzusunda məruzə edib.

Çıxışlardan sonra təşkilat komitəsi adından konfransın təşkilindəki xidmətlərinə görə prof. Cəfər Cəfərov, prof. Asəf Zamanov, prof. Mahirə Hüseynova, prof. Ahmet Duran, prof. Hülya Kasaboğlu, dos. Cumali Şabanov, dos. İlkin Qulusoy və Gürcüstan Dövlət Universitetinin professoru Elizabet Bjalava mükafatlandırılıb.

Sonda prof. Həsən Mirzəyevin ailəsi adından çıxış edən Mərkəzi Dəmiryol Xəstəxanasının baş həkimi Müşfiq Mirzəyev göstərilən yüksək diqqətə görə ADPU rəhbərliyinə və elmi ictimaiyyətə minnətdarlığını bildirib.

## PROFESSOR MAHİRƏ HÜSEYNOVANIN YUBİLEY TƏDBİRİ: VƏTƏN ÜÇÜN ÇIRPINAN MİSRALAR

Noyabrın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) beynəlxalq əlaqələr üzrə prorektor, Filologiya fakültəsinin dekanı v.i.e., Prezident təqaüdçüsü, Əməkdar müəllim, filologiya elmləri doktoru, professor Mahirə Hüseynovanın həyat və yaradıcılığına həsr olunmuş "Mahirə Nağıqızı - 62: Vətən üçün çırpınan misralar" adlı ədəbi-bədii tədbir keçirilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov yubilyarı təbrik edərək bildirib ki, tarixi Zəfər günləri ilə üst-üstə düşən bu gözəl tədbirdə alimlər, sənətçilər və istedadlı tələbələrin təqdimatında Mahirə Nağıqızı dünyası ilə yaxından tanış olacağıq. Rektor qeyd edib ki, prof. M.Hüseynova həm Pedaqoji Universitetin məzunu olub, həm də bu gün bu ali təhsil ocağına layaqətlə xidmət edir. O gözəl pedaqoq və tanınmış ictimai xadim olmaqla yanaşı, həm də görkəmli alim, məhsuldar şairə kimi müasir Azərbaycan filologiya elmində və poeziyasında ən tanınmış imzalardan biridir.

Professor Mahirə Hüseynovanın həyatı, elmi-pedaqoji və bədii fəaliyyətinə həsr olunmuş videoçarxın nümayiş olunmasından sonra Odlar Yurdu Universitetinin professoru, fil.e.d. Rüstəm Kamal M.Nağıqızının "Onun daş nağılı" əsərinin təhlili əsasında şairənin bədii yaradıcılığının əsas cizgilərindən söz açıb. Məruzəçi qeyd edib ki, Mahirə Nağıqızı yaradıcılığında Vətən, ana və sevgi mövzuları əsas xətt kimi keçir, bununla belə, həm də həssas peyzaj təsvirləri şairənin poetik ustalığının təzahürüdür. Peyzajlarda isə payızın təsviri sanki daxili həsrətin, ayrılığın, nisgilin bədii inikasıdır.




Respublikanın Əməkdar artisti Azad Şükürovun sevilən şairənin "Vətən" və "Vətən, ay Vətən" şeirlərini ifa etməsi xüsusi maraq oyadıb.

ADPU-nun professoru Mirvari İsmayılova M.Hüseynova və onun ADPU-da fəaliyyəti ilə bağlı məruzə edib. Tədbirdə Ədəbiyyatın tədrisi texnologiyası kafedrasının müdiri dos. Nazilə Abdullazadə və Müasir Azərbaycan dili kafedrasının müdiri dos. Könül Səmədova fakültədə yeni hazırlanan M.Nağıqızının son şeirlərindən ibarət "Lövbər adam" kitabı, prof. M.Hüseynovanın redaktorluğu ilə fakültənin dekan müavini Könül Həsənova və dos. Nazilə Abdullazadənin müəllifi olduğu

ARDI 3-CÜ SƏHİFƏDƏ

ƏVVƏLİ 2-Cİ SƏHİFƏDƏ

"Şuşa. Zəfərin təntənəsi" əsəri, Mahirə Hüseynova haqqında fakültənin alimlərinin düşüncələrinin əks olunduğu iki cilddən ibarət "Zirvədəki Azərbaycanlılar. Vətənpərvər alim" kitabı və fakültənin "Filoloq" qəzetinin xüsusi buraxılışını tədbir iştirakçılarına təqdim ediblər.

Tədbir çərçivəsində yubiliyar səmərəli fəaliyyətə və yüksək nailiyyətlərə görə ADPU-nun rektoru prof. C.Cəfərov tərəfindən universitetin "Fəxri Fərman"ı, Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin direktoru professor Sevinc Əliyeva tərəfindən Mərkəzin "Fəxri Fərman"ı, ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin (HİK) sədri dosent Vaqif Əliyev tərəfindən "Təhsil İşçiləri Azad Həmkarlar İttifaqları Komitəsinin 100 illik yubileyi" medalı və ADPU-nun Quba filialının direktoru dosent Yusif Alıyev tərəfindən filialın "Fəxri Fərman"ı ilə təltif olunub. Sonra tədbir tanınmış incəsənət ustalarının və fakültənin Meh ədəbi dərnəyinin üzvlərinin təqdimatında bədii proqramla davam etdirilib.

Sonda çıxış edən prof. M.Hüseynova onun elmi, pedaqoji və bədii yaradıcılığına göstərilən yüksək diqqətə görə təşəkkürünü bildirib.

## XALQ YAZIÇISI ADPU-NUN QONAĞI OLDU: ANAR - GƏNCLİYİN ARZUSU



Oktyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə görkəmli Azərbaycan yazıçı və şairi, Azərbaycan Yazıçılar Birliyinin (AYB) sədri, Xalq yazıçısı Anar Rzayevin həyat və yaradıcılığına həsr edilmiş "Anar - gəncliyin arzusu" adlı tədbir keçirilib. Tədbirdən əvvəl böyük yazıçının əsərlərindən ibarət sərgi ziyarət olunub.

ADPU-nun rektoru professor Cəfər Cəfərov ali təhsil ocağının kollektivi adından mötəbər qonağı salamlayaraq Anarın müasir Azərbaycan ədəbiyyatının inkişafında fenomenal bir hadisə olduğunu diqqətə çatdırıb və onu Pedaqoji Universitetin möhtəşəm zalında görməkdən məmnunluğunu ifadə edib. Rektor, Anarın həm də sevdiyimiz əsərlərin müəllifi, dönə-dönə izlədiyimiz filmlərin ssenari müəllifi, millət vəkili, yazıçılar birliyinin sədri kimi hər birimizin yaddaşında iz buraxan ictimai xadim olduğunu vurğulayıb.

ADPU-nun Ədəbiyyat kafedrasının müdiri dosent Razim Məmmədov Anarın yaradıcılığı haqqında maraqlı məruzə ilə çıxış edərək böyük yazıçının yazmağa heç vaxt tələsmədiyini, ancaq mövzuya hakim olandan sonra qələmini işə salaraq xalqın mənəvi həyatında böyük rol oynayan kamil əsərlər ərsəyə gətirdiyini diqqətə çatdırıb. Universitetin Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının baş müəllimi Adil Balıyev də Anar haqqında təəssüratlarını bölüşüb.

Filologiya fakültəsinin "Meh" ədəbi dərnəyinin üzvlərinin ifasında Anar yaradıcılığından parçalar səsləndirilib, yazıçının əsərləri əsasında çəkilən "Cavid ömrü", "Ötən ilin son gecəsi", "İmtahan", "Evləri köndələn yar" kimi filmlərdən fraqmentlər nümayiş olunub.

Öz təəssüratlarını bölüşən Xalq yazıçısı Anar Pedaqoji Universitetdə sonuncu dəfə olduğu dövrdən bəri burada xeyli yeniliklərin olduğunu, bu gün tələbələrin daha yaxşı təhsil alması üçün geniş imkanların açılmasının məmnunluq doğurduğunu vurğulayıb. ADPU-nun möhtəşəm zalında bir neçə dəfə görüşlərdə olduğunu deyən yazıçı yenidən bu zalda müəllimlər, tələbələrlə görüşməyin olduqca xoş olduğunu bildirib. Xalq yazıçısı tələbələrə kitab oxumağın vacibliyindən danışaraq, böyük Azərbaycan ədəbiyyatı ilə tərbiyə olunan gəncliyimizin əzəli torpaqlarımızı işğaldan azad etdiyini xüsusilə vurğulayıb. Müəllim və tələbələrin çoxsaylı suallarını cavablandıran Anar həyatı və yaradıcılığı ilə bağlı olduqca maraqlı məqamları ilk dəfə olaraq oxucuları ilə bölüşüb. Həmçinin, yazıçı, yaradıcılığa başladığı ilk dövrdən başlayaraq onun haqqında dərc edilən mənfi və müsbət fikirləri obyektiv şəkildə toplayaraq yaxınlarda irihəcmli əsər şəklində çap etdirməyə hazırlaşdığını, bununla da bir yazıçının keçdiyi çətin yolun təhlili üçün oxucuların ixtiyarına verəcəyini açıqlayıb.

Sonda tədbirin təşkilatçısı, ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı v.i.e. professor Mahirə Hüseynova universitetin çoxminli müəllim-tələbə heyəti adından böyük ədibə bu tarixi görüş üçün minnətdarlığını bildirərək, bu tip ictimai görüşlərin əsas məqsədinin yetişən gənc müəllimlərimizin mənəvi-sosial dünyasının zənginləşməsinə töhfə vermək olduğunu, bu qəbildən təvazökar olduğu qədər də böyük olan Anar yaradıcılığının müstəsna əhəmiyyət kəsb etdiyini diqqətə çatdırıb.

## ADPU-DA RESPUBLİKA ELMİ KONFRANSI: PSİXOLOGİYANIN AKTUAL PROBLEMLƏRİ



Oktyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Şöhrət" ordenli, Əməkdar elm xadimi, psixologiya elmləri doktoru, professor Əbdül Əlizadənin 90 illik yubileyinə həsr olunmuş "Psixologiyanın aktual problemləri" Respublika elmi konfransı öz işinə başlayıb.

Konfransda ali və orta ixtisas təhsili müəssisələrinin rəhbərləri, ictimai xadimlər, tanınmış psixoloqlar və pedaqoqlar iştirak ediblər.



Konfrans iştirakçıları əvvəlcə prof. Ə.Əlizadənin elmi əsərlərindən ibarət sərgi ilə tanış olublar.

Plenar iclası giriş sözü ilə açan ADPU-nun rektoru, konfransın təşkilat komitəsinin sədri professor Cəfər Cəfərov görkəmli alim Əbdül Əlizadənin Azərbaycan psixologiya elmində yeni məktəb yaradan böyük şəxsiyyət olduğunu diqqətə çatdırıb və onun elmi irsinin öyrənilməsində bu konfransın əhəmiyyətindən söz açıb. Rektor Respublika elmi konfransında üç bölmə üzrə psixologiya elminin müasir problemlərinə dair müxtəlif ali təhsil və elmi-tədqiqat müəssisələrindən daxil olmuş 100-ə qədər məruzənin dinləniləcəyini qeyd edib.

ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, konfransın təşkilat komitəsinin sədr müavini professor Asəf Zamanov ADPU-nun görkəmli alimlərinin elmi irsinin öyrənilməsi və yaşadılması məqsədi ilə silsilə tədbirlərin icra olunduğunu diqqətə çatdıraraq, yüksək ixtisaslı mütəxəssislərin hazırlanmasında və psixologiya elm sahəsində prof. Ə.Əlizadənin uğurlarından bəhs etmiş, onun nailiyyətlərinin ölkə rəhbərliyi tərəfindən həmişə yüksək qiymətləndirildiyini vurğulamışdır. Natiq, Ə.Əlizadənin uzun illər ərzində rəhbərlik etdiyi ADPU-nun Ümumi psixologiya kafedrasında alimə həsr edilmiş xüsusi guşənin açılmasını da konfrans iştirakçılarının diqqətinə çatdırıb. Çıxış edənlərdən Bakı Mühəndislik Universitetinin rektoru prof. Havar Məmmədov, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı prof. Fərrux Rüstəmov, Məktəbəqədər təhsil fakültəsinin dekanı dos. Nailə Hüseynova, BDU-nun Pedaqogika kafedrasının professoru Hikmət Əlizadə, Azərbaycan Milli Konservatoriyası nəzdində Musiqi Kollecinin direktoru prof. Nazim Kazımov, ADNSU-nun nəzdində Sənaye və Texnologiya Kollecinin direktoru dos. Faiq Şahbazlı, Təhsil İnstitutunun direktor müavini Aydın Əhmədov, prof. Şahlar Əsgərov və dos. Hökümə Əliyeva Azərbaycan psixologiya elminin inkişafında professor Əbdül Əlizadənin müstəsna rolundan söz açaraq böyük alimin ilk milli taksonomiyaları yaratdığını xüsusilə vurğulamış, eyni zamanda onun nəcib insani dəyərlərə malik böyük şəxsiyyət olduğunu bildirmişlər. Konfransda professor Ə.Əlizadənin seçilmiş əsərlərindən ibarət çoxcildliyin ilk cildi də təqdim olunub. ADPU-nun Ümumi psixologiya kafedrasının müdiri professor Ramiz Əliyev isə "Professor Əbdül Əlizadə" mövzusunda məruzə ilə çıxış etmişdir. Plenar iclasdan sonra Respublika elmi konfransı "Əbdül Əlizadə yaradıcılığında psixopedaqoji məsələlər", "Psixologiyada gender problemləri" və "Şəxsiyyət və etnopsixologiyanın aktual problemləri" bölmələrində işini davam etdirdi.

## ADPU-DA PROFESSOR ƏBDÜL ƏLİZADƏNİN XATİRƏ GUŞƏSİNİN AÇILIŞI OLUB



Görkəmli alim, Əməkdar elm xadimi, psixologiya elmləri doktoru, "Şöhrət" ordenli professor Əbdül Əlizadənin 90 illik yubileyi münasibəti ilə uzun illər çalışdığı və rəhbərlik etiyi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil fakültəsinin Ümumi psixologiya kafedrasında xatirə guşəsinin açılışı olub. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, fakültə dekanı dosent Nailə Hüseynova, dekan müavini ped.ü.f.d. Sübdabə İsgəndərova, kafedra müdiri professor Ramiz Əliyev, BDU-nun Pedaqogika kafedrasının professoru Hikmət Əlizadə, psix.ü.f.d. Səbinə Əlizadə və kafedranın əməkdaşları iştirak etmişdir. Rektor prof. Ə.Əlizadənin Azərbaycan psixologiya elminin inkişafındakı misilsiz xidmətlərindən söz açaraq, onun böyük bir məktəb yaratdığını vurğulamışdır. Prof. C.Cəfərov qeyd edib ki, ADPU-da görkəmli alimlərin xatirələrini yaşatmaq və onların böyük irsini gənclərə aşılamaq üçün Pedaqoji Universitetdə silsilə tədbirlər, konfranslar təşkil olunur.

Tədbirdə həmçinin prof. R.Əliyevin Ə.Əlizadənin 90 illiyi münasibəti ilə qələmə aldığı "Unudulmayan adam - Əbdül Əlizadə" kitabı da iştirakçılara təqdim olunub.

## TELEAPARICI JALƏ HƏSƏNLİ İLƏ GÖRÜŞ



Oktyabrın 17-də ADPU-nun Məktəbəqədər təhsil fakültəsi və SABAH qruplarının Tələbə Gənclər Təşkilatları (TGT), o cümlədən Səbail Rayon Gənclər və İdman İdarəsinin təşkilatçılığı ilə "Tarixi anlar medianın gözü ilə" adlı görüş keçirilib. Görüşün qonağı olan tanınmış teleaparıcı Jalə Həsənli 44 günlük Vətən müharibəsi dövründə qələbə xəbərinin ilk carçısı olaraq keçirdiyi hiss və duyğuları, həmin günlərlə bağlı fikirlərini tələbələrlə bölüşüb.

Sonda Jalə Həsənli aparıcılıq və media fəaliyyəti ilə bağlı tələbələri maraqlandıran sualları cavablandırıb, görüş maraqlı diskussiya ilə davam etdirilib.

# İRƏVAN MÜƏLLİMLƏR SEMİNARİYASININ 140 İLLİYİ MÜNASİBƏTİLƏ RESPUBLİKA ELMİ-PRAKTİK KONFRANSI VƏ KİTAB TƏQDİMATI KEÇİRİLDİ

Noyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) İrəvan Müəllimlər seminariyasının 140 illiyinə həsr olunmuş "Müəllim hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu" Respublika elmi-praktik konfransı və professor Fərrux Rüstəmovun "İrəvan Müəllimlər Seminariyası və onun məzunları" kitabının təqdimat mərasimi keçirilib. ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının tərəfdaşlığı ilə keçirilən konfrans və təqdimat mərasimində universitet rəhbərliyi, millət məkilləri, tanınmış alimlər və elm və təhsil xadimləri, professor-müəllim heyəti iştirak edirdi. Açılış nitqində universitetin rektoru professor Cəfər Cəfərov deyib: "Əməkdaşlarımız təhsil sahəsindəki xidmətləri ilə bərabər dövləti və dövlətçiliyi dəstəkləyən layihələr icra edir, mətbuatda və sosial şəbəkələrdə maraqlı elmi və publisistik məqalələrlə çıxış edir, kitablar nəşr etdirirlər.

Bu gün Respublika elmi-praktik konfransında prof. F.Rüstəmovun tarixi Azərbaycan torpağı olan İrəvanla bağlı fundamental tədqiqat əsəri olan "İrəvan Müəllimlər Seminariyası və onun məzunları" kitabını elmi ictimaiyyətə təqdim edirik. Əsərin metodoloji əsasını Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin "Bu gün biz yaxşı bilirik ki, Ermənistan dövləti tarixi Azərbaycan torpaqlarında yaranıb. Zəngəzur, Göyçə mahalı, İrəvan bizim doğma torpağımızdır. Biz qayıdacağıq" - fikirləri təşkil edir. Bu konsepsiyanın istiqamətləri 29 dekabr 2021-ci il tarixində Cənab Prezidentin imzaladığı "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Sərəncamında öz əksini tapmışdır. Sərəncama uyğun olaraq Təhsil Nazirliyinin və ayrıca ADPU-nun 17 maddədən ibarət tədbirlər planı təsdiq edilmiş, universitetdə il ərzində silsilə tədbirlər keçirilmişdir. İrəvanda maarifin və maarifçiliyin inkişafında müstəsna xidmətləri olan görkəmli maarifpərvər ziyalı Firidun bəy Köçərlinin adına təqaüd təsis etmişik."




Əsərin ön sözünün müəllifi, AMEA-nın müxbir üzvü, Riyaziyyat və Mexanika İnstitutunun baş direktoru professor Misir Mərdanov çıxış edərək vurğulayıb ki, tarixi yaratmaq da, yaşatmaq da, yazmaq da çox ciddi problemdir. "Bu baxımdan bizim də çoxlu çətinliklərimiz var. F.Rüstəmovun hazırladığı və Azərbaycan elmi ictimaiyyətinə təqdim etdiyi əsər məhz bu aspektdən olduqca faydalı və vaxtına yazılan bir əsərdir. Bu əsər sayəsində 1881-1917-ci illərdə fəaliyyət göstərən İrəvan Müəllimlər Seminariyasının fəaliyyəti hərtəfli surətdə, arxiv materialları əsasında tədqiq edilmiş, onun milli ruhu elmi əsaslarla təqdim olunmuşdur. Belə tədqiqatlar daha çox və sistemli aparılmalı, o cümlədən orta əsrlər və qədim dövr Azərbaycan maarifi də ciddi araşdırılmalıdır."



Müzakirələrdə çıxış edənlərdən millət vəkili, Qərbi Azərbaycan İcmasının sədri Əziz Ələkbərli, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, tarixçi alim Firdovsiyyə Əhmədova, Azərbaycanda Atatürk Mərkəzinin əməkdaşı dosent Nazir Əhmədli, ADPU-nun Ağsaqqallar Şurasının sədri professor Məlikməmməd Cəbrayılov, tanınmış pedaqoq və təhsil təşkilatçısı Asif Cahangirov, dos. Vidadi Bəşirov, dos. İramin İsayev və başqaları belə tədqiqat işlərinin həm pedaqoji fikir tarixi, həm də siyasi-ideoloji baza baxımından çox zəruri olduğunu, vaxtilə Cənubi Qafqazın intellektual mərkəzi olan İrəvanın tarixinin araşdırılmasında müstəsna rol oynadığını diqqətə çatdırıblar.

Sonda çıxış edən əsərin müəllifi professor Fərrux Rüstəmov universitet rəhbərliyi və konfrans iştirakçılarına minnətdarlığını bildirərək bu kitabı məhz Prezident İlham Əliyevin Sərəncamından və Onun elmə-təhsilə yüksək qayğısından ilham alaraq alim-vətəndaş borcunu yerinə-yetirmək amalı ilə ərsəyə gətirdiyini vurğulayaraq, bu cür tədqiqatların bütöv Azərbaycan ideologiyasının elmi-obyektiv bazasının genişləndirilməsində çox vacib olduğunu qeyd edib.

# GENDER YÖNÜMLÜ PEDAQOGİKA ÜZRƏ TƏHSİL RESURSLARININ TƏDRİS KURİKULUMLARINA İNTEQRASİYASI İLƏ BAĞLI YOL XƏRİTƏSİ HAZIRLANIB




Avropa İttifaqı tərəfindən maliyyələşdirilən, BMT-nin Qadınlar üzrə Agentliyi və BMT-nin Əhali Fondunun birgə həyata keçirdiyi "Avropa İttifaqı Gender Bərabərliyi namina: Birlikdə gender stereotiplərinə və gender əsaslı zorakılığa qarşı" proqramı çərçivəsində Elm və Təhsil Nazirliyi ilə əməkdaşlıq əsasında "Regional İnkişaf" İctimai Birliyi (RİİB) tərəfindən icra edilən "Genderə həssas məktəblərin təşviqi" layihəsi çərçivəsində noyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Azərbaycanda genderə həssas məktəblərin təşviqi: Gender yönümlü pedaqogika" mövzusunda təşkil edilmiş dəyirmi masada gender yönümlü pedaqogika üzrə hazırlanmış təhsil resurslarının tədris kurikulumlarına inteqrasiyası ilə bağlı yol xəritəsi hazırlanıb.

Aidiyyəti dövlət qurumlarının, pedaqoji kadr hazırlayan ali və orta ixtisas təhsil müəssisələrinin, beynəlxalq və qeyri-hökümət təşkilatlarının nümayəndələrinin iştirak etdiyi tədbir layihə çərçivəsində hazırlanan gender pedaqogikası üzrə məzmunun pedaqoji kadr hazırlayan ali və orta ixtisas təhsil müəssisələrinin kurikulumuna inteqrasiyasını təşviq etmək məqsədilə həyata keçirilib.

RİİB-in "Genderə həssas məktəblərin təşviqi" layihəsinin rəhbəri Zərifə Məmmədli çıxış edərək, ölkədə təhsil sahəsində görülən işlərə dəstək məqsədilə İctimai Birliyin yerli və beynəlxalq təşkilatlarla əməkdaşlıq əsasında həyata keçirdiyi layihələrdən danışıb, bu tədbirlərin davamı olan bugünkü müzakirələrin əhəmiyyətinə diqqət çəkib. Z.Məmmədli layihə çərçivəsində ali və ümumi təhsil müəssisələrində çalışan müəllimlərin genderə həssas pedaqogika üzrə bacarıqlarının artırılması, məktəb icması və geniş ictimaiyyət arasında gender məlumatlılığının artırılması istiqamətində görülən işlər haqqında məlumat verərək, müvafiq tədris proqramlarına inteqrasiya nəzərdə tutulan materialların təhsil müəssisələrində genderə həssas mühitin təkmilləşdirilməsində faydalı olacağına inandığını bildirib.

Təhsil İnstitutunun Layihələrin idarə olunması şöbəsinin müdiri Nailə Ömərova diqqətə çatdırıb ki, genderə həssas və keyfiyyətli təhsil sisteminin yaradılması yolunda ən effektiv vasitələrdən biri təhsil proqramlarının xüsusi kontekstə və ehtiyaclara uyğunlaşdırılması və müvafiq hədəf qruplarının təlimləndirilməsidir. Layihə çərçivəsində hazırlanan gender yönümlü pedaqogika məzmunu genderə həssas təhsil mühitinin formalaşması, müəllimlərin genderə həssas metodologiyalar barədə məlumatlılığının artırılmasında vacib əhəmiyyətə malikdir. Həmçinin hazırlanan məzmunun pedaqoji təhsilin kurikulumuna inteqrasiyası istiqamətində aparılan işlər, təcrübələr və bu sahədə atılacaq addımlar barədə də tədbir iştirakçılarına məlumat verilib.

Layihə üzrə əsas tərəfdaş universitetlərdən biri olan ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov öz çıxışında sosial həyatın bütün istiqamətlərində, xüsusilə də təhsil sahəsində gender bərabərliyinin təmin olunmasının mühüm əhəmiyyət daşıdığına diqqət çəkib. Xüsusilə də öyrənmə prosesində keyfiyyətin yüksəlməsi üçün gender pedaqogikasının əhəmiyyətli rolu, bu baxımdan ənənəvi pedaqogikadan gender pedaqogikasına keçid və genderə həssas mühitin formalaşdırılmasının vacib şərt hesab olunduğunu qeyd edib. Daha sonra təhsildə genderə həssas mühitin yaradılması və bu sahədə görülən işlər, gender pedaqogikası üzrə məzmunun





tədris kurikulumuna inteqrasiyası yolları və atılacaq növbəti addımlar barədə ətraflı müzakirələr aparılıb. Müzakirələrin nəticəsi olaraq təhsil siyasətindəki bərabərlik prinsipinin diqqətdə saxlanması, orta təhsil müəssisələrində gender bərabərliyinin təşviqi üçün pedaqoji kadr hazırlığının təkmilləşdirilməsi, müəllimlər üçün ixtisasartırma təhsilində gender pedaqogikasının proqrama daxil edilməsi, dərsliklərin qiymətləndirilməsi zamanı gender aspektinin nəzərə alınması, məktəbəqədər təhsildə də gender yönümlü pedaqogikanın tətbiqi, həmçinin gender pedaqogikası ilə bağlı müəllimlərin təlimləndirilməsində ali təhsil müəssisələrinin "Regional İnkişaf" İctimai Birliyi ilə əməkdaşlığının genişləndirilməsi və digər vacib məsələlərlə bağlı təkliflər qeydə alınıb.

# MİLLİ QƏHRƏMANIN TƏLƏBƏ QIZI: "ATAMIN ARZUSUNU YERİNƏ YETİRİB ŞAGİRDLƏRƏ VƏTƏN SEVGİSİNİAŞILAYACAĞAM."

Müsahibim Azərbaycanın Milli Qəhrəmanı, "Zəfər" ordenli Vətən müharibəsi şəhidi Şükür Həmidovun qızı Əzizə Həmidovadır. Əzizə bu il qəbul imtahanlarında iştirak edərək uğurlu nəticə əldə edib və ali məktəb seçimlərində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) ibtidai sinif müəllimliyi ixtisasını seçib. Sentyabrın 6-da Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov Əzizə və ailəsini qəbul edərək, Əzizə kimi gənclərimizin bizə qəhrəmanlarımızın əmanəti olduğunu vurğulayıb.

*Şükür Nəriman oğlu Həmidov 1975-ci il aprelin 1-də Qubadlı rayonunun Armudluq kəndində anadan olub. 2016-cı ilin Aprel döyüşlərində Lələtəpə yüksəkliyinin azad edilməsində böyük şücaət göstərən Şükür Həmidov Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 22 aprel 2016-cı il tarixli Sərəncamı ilə "Azərbaycanın Milli Qəhrəmanı" adına layiq görülüb və vaxtından əvvəl polkovnik rütbəsi alıb. Vətən müharibəsi zamanı Azərbaycanın ərazi bütövlüyü uğrunda misilsiz qəhrəmanlıq göstərən Şükür Həmidovun ən böyük arzusu işğal altındakı torpaqlarımızı, eləcə də doğma Qubadlı rayonunu işğaldan azad etmək olub və o, Qubadlının bir neçə kəndinin azad edilməsi əməliyyatlarında iştirak edib.*

*Milli Qəhrəman Şükür Həmidov 2020-ci ilin 22 oktyabrında Qubadlı rayonunun azadlığı uğrunda gedən döyüşlərdə şəhidlik zirvəsinə ucaldı.*

*Vətən müharibəsindəki şücaətlərinə görə, Prezident İlham Əliyevin Sərəncamı ilə ölümündən sonra "Zəfər" ordeni, "Füzulinin azad olunmasına görə", "Cəbrayılın azad olunmasına görə" və "Qubadlının azad olunmasına görə" medalları ilə təltif olunub.*

**– Xoş gördük, Əzizə! Səninlə söhbətləşmək həm olduqca çətin və məsuliyyətli, həm də qürurvericidir. İstərdik, ailəniz, atan haqqında xatirələrini bölüşəsən bizimlə. Şükür Həmidovun övladı olmaq necə hisdir?**

Xoş gördük! Bilirsiniz, bu mənim ilk müsahibəmdir. Çox ağırdır mənimçün atam haqqında danışmaq. Atamın qəhrəmanlığı, adı ilə nə qədər qürur duysam da, yoxluğunun acısını da hər zaman o fəxarət hissi ilə yanaşı yaşayıram.

Biz ailədə 4 nəfərik: Atam, anam, mən və kiçik qardaşım. Atam bu gün yanımızda olmasa da, mən hər zaman onu öz aramızda sayıram. Bu gün sizə bir qəhrəman yox, bir ata haqqında danışmaq istəyirəm. Onun necə bir qəhrəman olduğunu bütün xalqımız bilir. Tarixə adını yazan Şükür Həmidov kimi bir insanın övladı olmaq dillə təsviri mümkün olmayacaq qədər qürurvericidir.

Bilirsiz, mən atamın o cür yüksək adı daşımasına baxmayaraq, özünü hər zaman sadə aparmasına görə daha çox fəxr etmişəm. Bizə də tövsiyəsi məhz bu idi. Bizi sadə, vətəninə, millətinə faydalı bir övlad kimi yetişdirmək istəyirdi.

Atam elə bir insan idi ki, onun hər günü xatirəyə çevirilirdi. Onun Aprel döyüşləri ilə bağlı bir xatirəsini bölüşmək istərdim. Biz həmin vaxt Füzulidə yaşasaq da, Aprel döyüşlərinin başlamasından xəbərsiz idik. Atam döyüş başlasa da, bizdən gizlədirdi. Ağır artilleriyanın atəş səslərindən bilirdik ki, nəsə var. Atama zəng edib soruşduq ki, hardasan. Dedi, otağımda oturub Şabanın (red. - məşhur türk komediya aktyoru Kamal Sunal) filminə baxıram. Biz bilirdik ki, döyüş gedir, ona görə də, soruşduq, müharibə başlayıb? Dedi, milləti panikaya salmayın, müharibə yoxdur. Müharibə olsa, mənə xəbər edin, mən də gedim.

Bu hadisə heç kimin yadından çıxmır; döyüşdə olduğu halda Şabanın filminə baxıram dedi.

**– Atanın ən böyük arzusunun sənin müəllimlik peşəsinə yiyələnmən olduğunu bir neçə dəfə qeyd etmisən. Bu gün artıq bu yolda uğurla irəliləyirsən. Özünü müəllim kimi necə təsəvvür edirsən?**

Mənim hər iki babam və anam müəllimlik peşəsinə yiyələniblər. Atam da məni onların davamçısı kimi görmək istəyirdi. Bu onun



ən böyük arzusu idi. Bu gün mən həm sevinirəm, həm də çox kədərlənirəm. Atamı arzusuna çatdırdığıma görə çox sevinirəm, kədərlənməyimin səbəbi isə odur ki, atam bu sevinci mənimlə bərabər yaşaya bilmədi... Mən hələ uşaqlıqdan dərslərimi özümdən müəllim kimi soruşurdum. Həm müəllim, həm də şagird olurdum. İndi artıq müəllim kimi yetişmək üçün ilk addımlarımı atıram. Hamı kimi mənim də qarşımda bir vəzifə var: Gənclərdə vətənpərvərlik hissini, işğaldan azad olunmuş torpaqlarda şəhid və qazilərimizin yazdığı Zəfər tarixini heç vaxt unutmamağı, Vətən yolunda canımızdan keçmək kimi hissləri aşılamaq.

**– Müəllimlik peşəsinə yiyələnmək üçün məhz Pedaqoji Universitetdə təhsil alacağına necə qərar verdin?**

Müəllimlik mənim üçün böyük bir hədəf idi. Bu yolda Pedaqoji Universitetin doğru bir seçim olmasına böyük ümidim vardı. Seçimimdə yanılmadım.

**– Ali məktəb seçimlərinin nəticələri elan olunandan sonra ADPU-nun rektoru ilə görüşün oldu. Bu görüşlə bağlı təəssüratlarından danışa bilərsənmi?**

Sentyabrın 6-da rektorumuz professor Cəfər Cəfərovla yaddaqalan görüşümüz oldu. Mən bu görüşə çox həyəcanla getdim. Amma həyəcanım görüş baş tutanadək davam elədi. Mən bu kollektivdə yeni bir ailə, – səmimi, qayğıkeş bir ailə qazandım. Fürsətdən istifadə edib, Cəfər müəllimə səmimi görüşə görə bir daha təşəkkürümü bildirirəm.

**– Əzizə, istərdik, tələbəlik həyatından bəhs edəsən? Müəllimliyin sirlərinə yiyələnmək çətin deyil ki?**

Mən bu gün elə bir kollektiv içərisindəyəm ki, sanki onları illərdir tanıyıram. İstər müəllimlərim, istərsə də tələbələr çox mehribandırlar. Mən sevinirəm ki, belə bir kollektivdəyəm. Biz burada müəllimlik peşəsinin sirlərinə yiyələnməyə çalışırıq. Əlbəttə, bu çox çətindir. Ona görə ki, çox şey öyrənə bilərik, lakin əsas olan o öyrəndiklərimizi şagirdlərimizə çatdıra bilməkdir. Bu baxımdan müəllimliyin sirlərinə yiyələnmək, həqiqətən, çox çətin, məsuliyyətli, eyni zamanda fərəhli bir işdir.

**– Faydalı söhbətə görə təşəkkür edirik. Sonda gənclərə, gələcəyin müəllimlərinə və bu peşəni seçmək istəyən abituriyentlərə nələri demək istərdin?**

Mən də sizə səmimi söhbətə görə minnətdarlığımı bildirirəm. Mənim üçün çox çətin olsa da, ümidvaram ki, suallarınızı cavablandırmağı bacardım.

Bütün abituriyentlərimizə uğurlar arzulayıram. Çalışıb həyatda öz sevdikləri peşəyə yiyələnsinlər, vətənlərinə faydalı bir kadr kimi yetişsinlər.

Taleh MİRZƏYEV





## HÜSEYN CAVİDİN 140 İLLİK YUBİLEYİ QEYD OLUNUB

Noyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə görkəmli Azərbaycan dramaturqu Hüseyn Cavidin anadan olmasının 140 illik yubileyinə həsr olunmuş "Hüseyn Cavid-140" adlı tədbir keçirilib.

Tədbirdən əvvəl H.Cavidin əsərlərindən ibarət sərgi təqdim olunub.



Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov açılış nitqi ilə çıxış edərək Hüseyn Cavidin XX əsr Azərbaycan ədəbiyyatında romantizm ədəbi cərəyanının əsas nümayəndəsi, milli romantik şeirin və mənzum faciənin banisi olduğunu diqqətə çatdırıb. Rektor vurğulayıb ki, onun yaradıcılığında milli və bəşəri ideallların yüksək təcəssümü hələ bir əsr bundan əvvəl dünyaya verilmiş mesajdır. Tədbirdə AMEA-nın N.Gəncəvi adına Ədəbiyyat İnstitutunun Yeni dövr Azərbaycan ədəbiyyatı şöbəsinin baş elmi işçisi dosent Lütviyyə Əsgərzadə "Hüseyn Cavid: mühiti və müasirləri", ADPU-nun Ədəbiyyat kafedrasının dosenti Məlahət Babayeva isə "Hüseyn Cavid irsi və müasir dövr" mövzularında məruzələrlə çıxış edib, həmçinin, Ədəbiyyat kafedrasının müdiri dosent Razim Məmmədov və Ədəbiyyatın tədrisi texnologiyası kafedrasının müdiri dosent Nazilə Abdullazadə də böyük dramaturqun yaradıcılığı haqqında təəssüratlarını bölüşüblər.

Hüseyn Cavidin qızı Turan Cavidin xatirələrindən ibarət videoçarxın nümayişindən sonra fakültədə fəaliyyət göstərən Meh ədəbi dərnəyinin üzvlərinin təqdimatında ölməz sənətkarın yaradıcılığından əbədiyaşar incilər təqdim olunub.

# UNİVERSİTETİMİZ ZƏFƏR GÜNÜNÜ

## ADPU-DA GÖRÜŞ: ŞANLI ZƏFƏRİMİZ - MÜHARİBƏ İŞTİRAKÇILARININ GÖZÜ İLƏ

Oktyabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Virtual Qarabağ" İKT Mərkəzinin layihəsi əsasında "Şanlı zəfərimiz – Müharibə iştirakçılarının gözü ilə" adlı tədbir keçirilib.

Əvvəlcə Vətən uğrunda canından keçən şəhidlərimizin əziz xatirələri bir dəqiqəlik sükutla yad edildi.

Açılış nitqi ilə çıxış edən layihə rəhbəri Aidə Ramiz vurğuladı ki, layihənin əsas məqsədi Vətən müharibəsində qazandığımız tarixi zəfərimizin böyük qələbənin qurucuları olan canlı şəhidlərin, qazilərimizin dilindən gənclərimizə təbliğ olunması, canlı əfsanələrlə tələbələrin görüşünün və ünsiyyətinin təmin edilməsidir.

Daha sonra Vətən müharibəsi qaziləri Ülvi Qədir, Hasil Hümbətov və Ramin Məmmədov 44 günlük savaşla bağlı öz xatirələrini bölüşərək, Azərbaycan əsgərinin keçdiyi müzəffər döyüş yolu haqqında söz açdılar.

Tələbələrin böyük marağını cəlb edən görüşdə qazilər gənclərin suallarını cavablandırdı, Azərbaycan gəncinin Vətən üçün daim hər şeyə hazır olduğu xüsusilə diqqətə çatdırıldı.





(XTQ) ehtiyyatda olan zabitləri kapitan Şamxal Ağayev, baş leytenant Elsevər Ağayev və 44 günlük savaşda cəbhədə fəaliyyət göstərən tanınmış jurnalistlərdən İctimai Televiziyanın (İTV) əməkdaşı Xanlar Mehdiyev tələbələrin sualları əsasında 44 günlük müharibə haqqında təəssüratlarını bölüşüb, xüsusi təyinatlılar Şuşaya qədər uzanan döyüş yollarından danışaraq Azərbaycan xalqının ordunun arxasında olmasının, hər kəsin dəmir yumruq kimi birləşməsinin qələbəmizi şərtləndirən vacib amil olduğunu qeyd ediblər.

## "44 GÜNLÜK DASTAN" LAYİHƏSİ ÇƏRÇİVƏSİNDƏ ADPU-DA QAZİLƏRLƏ GÖRÜŞ KEÇİRİLİB




Oktyabrın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) tərəfdaşlığı ilə Azərbaycan Respublikası Gənclər Fondu (AzGF), Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ), və Böyük Qayıdış Gənclər Təşkilatının (BQ GT) təşkilatçılığı ilə 44 günlük Vətən müharibəsinə həsr edilmiş "44 Günlük Dastan" layihəsi çərçivəsində Pedaqoji Universitetdə qazilərin tələbələrlə görüşü keçirilib.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi və şəhidlərimizin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.

ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev açılış nitqi ilə çıxış edərək qeyd edib ki, universitetdə Vətən müharibəsi qəhrəmanları ilə mütəmadi görüşlərin keçirilməsinə xüsusi diqqət ayırılır. Prorektor qeyd edib ki, şəhidlərin xatirəsinə həsr olunmuş tədbirlər, qazilərlə görüşlərin keçirilməsi gələcəyin müəllimlərinin yetişdirilməsində müstəsna əhəmiyyət daşıyır.

ATGTİ-nin sədri Pərviz Mirələmli və "Böyük Qayıdış" Gənclər Təşkilatının icraçı direktoru Nail Şükürov da çıxış edərək layihənin məqsədinin Vətən müharibəsi qəhrəmanlarını tələbələrimizə tanıtmaq, zəfər tariximizi daha yaxından öyrənməyə dəstək vermək olduğunu bildiriblər. Qeyd olunub ki, azı 15 ali təhsil müəssisəsində bu tip görüşün keçirilməsi nəzərdə tutulur.

Tarixi zəfərin kadrlarını özündə əks etdirən videoçarxın nümayişindən sonra tədbirin qonağı olan Vətən müharibəsi qaziləri Əhliyət Mehdiyev, Coşqun Şəfiyev, Tural Abdullayev, Vətən Süleymanov, həmçinin ADPU-nun qazi tələbələri Cavid Abdinov və Yusif İsaqzadə ilə panel görüş keçirilib. Öz döyüş yollarından danışan və 44 günlük savaşla bağlı təəssüratlarını bölüşəndən sonra sual-cavab sessiyası keçirilib. Təxminən 400 nəfərin iştirak etdiyi görüşdə qazilər tələbələrin çoxsaylı suallarını cavablandırıblar.

## ŞƏHİDLİYİN MUXTAR ZİRVƏSİ

Oktyabrın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Kimya və biologiya fakültəsinin təşkilatçılığı ilə Vətən müharibəsi şəhidi baş leytenant Muxtar Qasımlının xatirəsinə həsr olunmuş "Şəhidliyin Muxtar zirvəsi" adlı tədbir keçirilib. Tədbirdə Kimya və biologiya fakültəsinin dekanı dosent Elnarə Mehbalıyeva, dekan müavini dosent Elnarə Muradova, Muxtar Qasımlının valideynləri Almaz Qasımova və Əli Qasımov, fakültənin müəllim və tələbə heyəti iştirak edib. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Tədbiri giriş sözü ilə açan fakültə dekanı dos. E.Mehbalıyeva şəhidlərimizin əbədi xatirəsindən danışmışdır. Çıxış edən şəhid Muxtar Qasımlının valideynləri göstərilən diqqətə görə universitet rəhbərliyinə təşəkkürlərini bildirmiş, şəhidlərin xatirələrinin yaşadılmasının onları daim yaşatdığını vurğulamışlar.



Tələbələrin hazırladıqları kompazisiyalar, səhnəciklər və şeirlər ifa olunmuş, şəhidimizin əbədi xatirəsini özündə əks etdirən videoçarxlar nümayiş olunmuşdur.

## QAZİ VƏ JURNALİSTLƏRLƏ GÖRÜŞ: 44 GÜNÜN İZİ İLƏ

Oktyabrın 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin təşkilatçılığı ilə "44 Günün izi ilə" adlı görüş keçirilib.

Əvvəlcə Vətən uğrunda canlarından keçmiş şəhidlərimizin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Şöbə müdiri Turan Kərimli çıxış edərək qonaqları və tədbir iştirakçılarını salamlayıb və görüşün məqsədinin şanlı zəfər tarixinin müxtəlif aspektləri haqqında prosesin iştirakçısı olan hərbçilərimiz və jurnalistlərimizin dilindən dinləmək olduğunu diqqətə çatdırıb.

Birinci Qarabağ və Vətən müharibələrini özündə əks etdirən videoçarxların nümayiş olunması ilə ötən 30 il ərzində Azərbaycanın dağınıqlıq vəziyyətindən qüdrətli dövlətə çevrildiyi və nəhayət, torpaqlarımızı işğaldan azad etdiyimiz vuğulanıb.

Görüşdə Vətən müharibəsi qaziləri, Xüsusi Təyinatlı Qüvvələrin

## GƏNCLƏRİN İNFORMASİYA MÜHARİBƏSİNDƏ AKTİV İŞTİRAKÇILIĞI İLƏ BAĞLI PANEL GÖRÜŞ



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin və Azərbaycan Respublikası Gənclər Təşkilatları Milli Şurasının (NAYORA) təşkilatçılığı ilə gənclər təşkilatlarının rəhbərlərinin "Post-müharibə dövründə gənclərdən olan gözləntilər və informasiya müharibəsində aktiv iştirakçılıq" mövzusunda tələbələrlə panel görüşü keçirilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli Pedaqoji Universitetdə gənclərin sosial şəbəkələrdə səmərəli fəaliyyətinə dəstək vermək məqsədi ilə görülən işlərdən, bu sahədə şöbənin və universitetin gənclər təşkilatlarının fəaliyyətindən danışıb.

NAYORA-nın sədr müavini, Vətəndaş Cəmiyyətində Debat İctimai Birliyinin sədri Ülviyyə Axundova, təşkilatın İdarə Heyətinin üzvü, Böyük Qayıdış Gənclər İctimai Birliyinin sədri Nail Şükürov, Gənclər üçün Təhsil Mərkəzi İctimai Birliyinin sədri Fəxrəddin Həsənzadə və Gənc Müəllimlər Assosiasiyasının sədri Rüfət Əsədzadənin spikerliyi ilə keçirilən görüşdə "Post-müharibə dövründə gənclərdən olan gözləntilər və informasiya müharibəsində aktiv iştirakçılıq" mövzusu üzrə aktiv müzakirələr aparılıb.

Tələbələr müzakirələrdə təkliflərini səsləndirmiş, həmçinin spikerlərə onları maraqlandıran sualları ünvanlayıblar.

# COŞĞU İLƏ QEYD EDİR

## ŞAMAXI FİLİALININ MÜƏLLİM VƏ TƏLƏBƏLƏRİ HƏRBİ QƏNİMƏTLƏR PARKINA EKSKURSİYA EDİBLƏR

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialının Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı ilə "Zəfər Günü" münasibəti ilə filialın bir qrup müəllim və tələbələrinin Hərbi Qənimətlər Parkına ekskursiyası təşkil olunub. Tələbələr ekskursiya çərçivəsində Vətən müharibəsi zamanı qənimət götürülən tanklar, döyüş maşınları, artilleriya qurğuları, zenit-raket kompleksləri, atıcı silahlar, həmçinin Azərbaycan ərazisinə atılmış "İsgəndər-M" raketinin qalıqlarına tamaşa etdilər, videozalda zəfər tarixini əks etdirən filmi izlədilər.




## ZƏFƏRİN SƏSİ




Noyabrın 3-də ADPU-nun Riyaziyyat fakültəsinin təşkilatçılığı ilə Zəfər gününə həsr olunmuş "Zəfərin Səsi" adlı tədbir keçirilib. Tədbirdə universitet rəhbərliyi, fakültə dekanları, professor-müəllim heyəti və tələbələr, o cümlədən, Vətən müharibəsi şəhidi şəhid Həsənağa Şirvaninin anası Şəfəq Rəfiyeva, qazi Məbud Əhmədov, şəhid Rüfət Əlifovun qardaşı Orxan Əlifov və şəhid Zaur Dadaşovun qardaşı Ziya Dadaşov iştirak ediblər.

Əvvəlcə qonaqlar foyedə riyaziyyat müəllimliyi ixtisasının III tədris ilinin tələbələri Sara Məmmədova və Aydan Ağalarzadənin rəsmlərindən ibarət vətənpərlik mövzusunda rəsm sərgisi ilə tanış olublar.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov 8 Noyabr - Zəfər Gününün müasir tariximizə qızıl hərflərlə yazılmış ən önəmli tarixlərdən biri olduğunu diqqətə çatdırıb.

Rektor qeyd edib ki, məhz iki il bundan öncə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin rəhbərliyi altında və xalqın dəstəyi ilə müzəffər Azərbaycan ordusu işğal altındakı torpaqlarımızı azad edərək şəhid qanları bahasına ölkəmizin ərazi bütövlüyünü bərpa etdi.

İşğaldan azad olunmuş rayonlar haqqında videoçarx izlənildikdən sonra universitet tələbələri və ADPU-nun baza məktəbi olan M.Rahim adına 7 nömrəli tam orta məktəbin şagirdlərinin təqdimatında bədii hissə təqdim olunub. Bədii hissədə Riyaziyyat fakültəsinin III tədris ili tələbəsi Dilarə Abdullayeva Xudayar təsnifini ifa edib. Tədbir qazi Məbud Əhmədovun ifası ilə davam edib.

## AĞCABƏDİ FİLİALINDA ZƏFƏR GÜNÜ MÜNASİBƏTİLƏ ƏDƏBİ-BƏDİİ GECƏ KEÇİRİLİB

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında 8 Noyabr – Zəfər Günü münasibətilə ədəbi-bədii gecə keçirilib.




Tədbiri giriş sözü ilə "Dillər, ədəbiyyat və onların tədrisi texnologiyası" kafedrasının müdiri dosent Vaqif Allahverdiyev açmışdır. 30 illik həsrətə son qoyulmasında qələbəmizin qazanılmasında qəhrəmanlıq göstərərək vətən, torpaq və xalq yolunda həlak olmuş şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir.

Tədbirə "Aran" qəzetinin və Aran Televiziyasının nümayəndələri, şəhid ailələri, qazilər və müharibə iştirakçıları dəvət olunmuşdur.

ADPU-nun Ağcabədi filialının şəhid məzunları Abbasov Ağaqardaş İlham oğlunun atası və Məmmədli Namiq Ağamməd oğlunun atası çıxış edərək şəhidlik zirvəsinə ucalmış məzunların keçdiyi şərəfli döyüş yolundan danışmış, şəhid məzunlar haqqında hazırlanmış videoçarx nümayiş etdirilmişdir. Sonra söz Aran Televiziyasının rəhbəri, Azərbaycan Yazıçılar Birliyinin üzvü Gündüz Sevindiyə verilmişdir.

Tədbirin gedişində tələbələr tərəfindən hazırlanmış müharibə səhnələrini əks etdirən və qələbə müjdəli kompozisiyalar nümayiş etdirilmiş, şeirlər söylənilmişdir.

## QAZİLƏR VƏ ŞƏHİD AİLƏLƏRİ İLƏ GÖRÜŞ KEÇİRİLİB



ADPU-da 8 Noyabr - Zəfər Günü münasibətilə Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Ü.Hacıbəyli 68" Ərazi Partiya Təşkilatı (ƏPT) tərəfindən qazilər və şəhid ailələri ilə görüş keçirilib.

Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsindən sonra şəhidlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib.

"Ü.Hacıbəyli 68" ƏPT-nin sədri dosent Sultanəli Qurbanov giriş sözü ilə çıxış edərək qeyd edib ki, şanlı zəfərimizi bizə yaşadan şəhid və qazilərimizin irsinin gənc nəslə aşılanmasında belə tədbirlərin önəmindən danışıb.

Zəfər Günü ilə bağlı videoçarxın nümayiş olunmasından sonra Vətən müharibəsi şəhidləri Tural Məmmədovun bacısı, jurnalist Yasəmən Məmmədova, mayor Ramid Hacıyevin həyat yoldaşı Sevinc Hacıyeva, kapitan Həmid Cəfərlinin anası Zemfira Cəfərova və Hərbi Dəniz Qüvvələrinin xüsusi təyinatlı qüvvələrinin "Dəniz pişikləri" dəstəsinin döyüşçüləri, qazilər Vətən Süleymanov və Coşqun Şəfiyev tələbələrlə həmsöhbət olub, öz xatirələrindən söhbət açıblar.

Yekunda ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev qonaqlara təşəkkür edib və Pedaqoji Universitetdə gənclərin vətənpərlik tərbiyəsinə xüsusi diqqət ayırıldığını, qazi və şəhid ailələri ilə mütəmadi görüşlərin keçirildiyini diqqətə çatdırıb.

## ZƏFƏR SALNAMƏSİ



Noyabrın 5-də ADPU TGT-nin təşkilatçılığı ilə 8 Noyabr – Zəfər Gününə həsr olunmuş "Zəfər Salnaməsi" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Səbail Rayonu Gənclər və İdman İdarəsinin (GİI) rəisi Elnarə Əliyeva və Nəsimi Rayonu Gənclər və İdman İdarəsinin (GİI) rəisi Şahmar Möhsümov, prorektorlar, fakültə dekanları və tələbələr iştirak ediblər.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Giriş sözü ilə çıxış edən rektor prof. Cəfər Cəfərov diqqətə çatdırıb ki, artıq doğma torpaqlarımıza böyük qayıdış prosesi tam sürətlə davam edir, bölgədə sürətli bərpa-quruculuq işləri, nəhəng infrastruktur layihələri həyata keçirilir. Qazanılan tarixi qələbənin şəhid qanları bahasına əldə edildiyini vurğulayan rektor Vətən müharibəsi şəhidləri və qaziləri sırasında ADPU-nun da tələbə və məzunlarının olduğunu deyib: "13 tələbə və məzunumuz, habelə bu ilin sentyabr təxribatları zamanı da 1 məzunumuz şəhadətə yüksəlib. Tələbələrimiz arasında hazırda 5 nəfər qazimiz, məzunlarımızdan 200-dək müharibə iştirakçısı var."

Zəfərlə bağlı videoçarxın izlənilməsindən sonra ADPU TGT-nin "Buta" instrumental musiqi ansamblının təqdimatında "Xudayar" təsnifi, "Azərbaycan", "İncə belli" mahnıları, "Laçın" şeiri ifa olunmuş, "Uzundərə" və "Naxçıvani" rəqsləri nümayiş olunmuşdur.

Tələbələr Zəfər Günü ilə bağlı səhnəciklər göstərmişlər. ADPU-nun dosenti, tarixçi Pərviz Səfərov Dağlıq Qarabağ münaqişəsinin tarixi kökləri haqqında ətraflı məlumat vermişdir. Sonda incəsənət nümayəndələrinin iştirakı ilə konsert proqramı təqdim olunub.

## ADPU-NUN FAKÜLTƏLƏRİNDƏ ZƏFƏR GÜNÜ SİLSİLƏ TƏDBİRLƏRLƏ QEYD OLUNUB



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 8 Noyabr - Zəfər Günü münasibəti ilə silsilə tədbirlər keçirilir. Universitetin fakültələrində, bölgələrdəki filiallarında, tərkibindəki Pedaqoji Kollecdə və baza məktəbində keçirilən Zəfər Günü ilə bağlı müxtəlif tədbirlər sırasında Kimya və biologiya fakültəsinin təşkil etdiyi "Zəfər Günü" adlı intellektual yarışı, İncəsənət və fiziki tərbiyə fakültəsində və Məktəbəqədər təhsil fakültəsində Zəfər Günü münasibəti ilə keçirilən tədbirləri, Fizika fakültəsində keçirilən "Qayıdış" adlı tədbirləri misal göstərmək olar. Ümumən, Pedaqoji Universitet ailəsi Zəfər Gününü böyük coşğu ilə qeyd edib.

# TÜRKİYƏ UNİVERSİTETLƏRİ İLƏ

## TÜRKİYƏNİN AZƏRBAYCANDAKI TƏHSİL MÜŞAVİRİ ALİ RZA ALTUNEL ADPU-NUN QONAĞI OLUB



Türkiyə Respublikasının Azərbaycan Respublikasındakı təhsil müşaviri cənab Ali Rza Altunel ADPU-nun rektoru, professor Cəfər Cəfərov ilə görüşüb. Görüşdə ADPU-nun Tədris Departamentinin direktoru Sənan Əliyev, Əcnəbi tələbələrlə iş şöbəsinin müdiri Aynurə Əsgərova, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Gülnar Ələkbərova və Rəna Həsənova iştirak ediblər.

"Bir millət, iki dövlət" prinsipi əsasında qurulan münasibətlərin yüksək səviyyədə olduğunu bildirən rektor Cəfər Cəfərov görüşün keçirilməsindən məmnun qaldığını ifadə edib və yüksək səviyyədə inkişaf edən Türkiyə-Azərbaycan münasibətlərinin bütün Türk dünyası üçün layiqli nümunə olduğunu qeyd edib. Prof. C.Cəfərov, həmçinin, ADPU-da həyata keçirilən islahatlar, infrastrukturun yenilənməsi, təhsilin keyfiyyətinin yaxşılaşdırılması və beynəlmiləlləşdirilməsi, beynəlxalq əlaqələrin genişləndirilməsi, xarici dillərin tədris səviyyəsinin yüksəldilməsi sahəsində gerçəkləşən tədbirlər barədə ətraflı məlumat verib. Yekunda cənab Ali Rza Altunel ADPU-nun "Türk Araşdırmaları" Elmi Tədqiqat Mərkəzini ziyarət edərək universitetlə tanış olub.

## ÖZGÜR BOLAT PEDAQOJİ UNİVERSİTETİN QONAĞI OLUB

Türkiyənin tanınmış pedaqoqu, yazıçı, təhsil tədqiqatçısı və eksperti Özgür Bolat ADPU-nun qonağı olub. Görüşdə gələcək əməkdaşlıq istiqamətləri müzakirə edilib. Qeyd edək ki, tanınmış pedaqoq-alim, yazıçı, təhsil tədqiqatçısı və eksperti Özgür Bolat, Təhsil istiqaməti üzrə Boğaziçi Universitetində bakalavr, Harvard Universitetində magistr, Kembric Universitetində doktorantura təhsili almışdır. O, həmçinin MIT Sloan İdarəetmə məktəbində (MIT Sloan School of Management) liderlik ixtisası üzrə doktorantura dərsləri alıb və



orada tədqiqatlar aparıb. Müəllifi olduğu "Məni mükafatla cəzalandırma" adlı kitabı təxminən 500 min ədəd satılıb. Valideynlər məktəbinin (Anne-Baba okulu) yaradıcısıdır. Özgür Bolat "Lider müəllimlər","Özünə inam" və "Google" ilə "Rəqəmsal valideynlik" kimi layihələr, "İstedadı İdarəetmə Testi", "Parentwiser" mobil tətbiqinin rəhbəridir.

## QAZİ UNİVERSİTETİ İLƏ ƏMƏKDAŞLIQ PROTOKOLU VƏ ERASMUS SAZİŞİ İMZALANIB

Türkiyə Cümhuriyyətinin Qazi Universitetində Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) ilə təhsil, akademik və mədəniyyət məsələlərini əhatə edən Əməkdaşlıq Protokolu və Erasmus sazişinin imzalanma mərasimi keçirilib. Qazi Universiteti rektorluğunun Yeni Sənət zalında keçirilən protokol mərasimində rektorlar prof. Musa Yıldız və prof. Cəfər Cəfərov müqavilələri imzalayıblar.

Mərasimdə Qazi Universiteti nümayəndə heyətinin üzvlərindən prorektorlar prof. Yücel Gelişli və prof. Fazlı Polat, rektorun məsləhətçiləri prof. Fahri Temizyürek və Dr. Ahmet Bilal Dostbil, Qazi Təhsil Fakültəsinin dekanı prof. Mahmut Selvi, Təhsil və Xarici Əlaqələr Qurumunun Koordinatoru prof. İhsan Kalenderoğlu, Koordinator müavini Dr. Fatma Nur Fişne, Qazi TÜRKDAM-ın direktoru prof. Alev Çakmakoğlu Kuru və direktor müavini prof. Bülent Aksoy, Qazi TÖMER direktor müavini prof. Mustafa Kurt, Qazi EPAR Müdiri dos. Mahmut Çitil, Baş katib prof. Raqib Akyürek, Baş katibin müavinləri Raşit Yıldırım və Mehmet Əli Özkan iştirak edib. ADPU nümayəndə heyətindən Azərbaycan Respublikasının Türkiyədəki Səfirliyinin təhsil müşaviri rof. Nacibə Nəsibova, prorektorlar dos. Eldar Aslanov və Könül Pirverdiyeva, dekan müavini Könül Həsənova və Beynəlxalq Əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova iştirak ediblər.

Akademik əməkdaşlıq üçün bir araya gələn nümayəndə heyətləri protokol imzalanma mərasimindən əvvəl Azərbaycanın Mingəçevir Dövlət Universiteti (MDU) və Karatay Universitetinin tərəfdaşlığı ilə "8 Noyabr – Zəfər Günü"nün ikinci ildönümü münasibətilə təşkil olunan proqramda iştirak ediblər. Onlayn proqramda çıxış edən təhsil müşaviri prof. N.Nəsibova deyib: "Prezident İlham Əliyevin Azərbaycan Respublikasında Qarabağ müharibəsində qazanılan qələbənin şərəfinə elan etdiyi Zəfər Gününün tarixi əhəmiyyəti var. Bizim ümumi qələbəmiz hər yerdə qeyd olunur. Qazi Universitetində keçiriləcək təntənəli tədbir üçün də rektor prof. M.Yıldıza və əməyi keçən hər kəsə təşəkkür edirəm".

Qazi Universitetinin rektoru prof. M.Yıldız çıxışında deyib: "Bu gün bizim üçün əhəmiyyətli bir gündür. Qarabağ zəfərinin ikinci ildönümüdür. Qarabağ hadisələri başlayanda Can Azərbaycana dəstəyimizi göstərmək üçün Qazi Universitetinin binasına Azərbaycan bayrağını və Türkiyə Cümhuriyyətinin bayrağını



asdıq. Yenə o vaxt Qazi Universitetində Qarabağın dünəni, bu günü və sabahı mövzusunda panel keçirdik. Bu paneldə müharibənin qələbə ilə başa çatacağını, otuz il əsarətdə olan torpaqların əsarətdən azad ediləcəyini bildirdik. Bu gün bu proqramda MDU rektoru prof. Şahin Bayramovun dəvəti ilə qonaq olduq. Universitetimizdə də bayram proqramı olacaq. Karatay Universitetinin rektoru prof. Fevzi Rıfat Ortaça da təşəkkür edirəm".

Pedaqoji Universitetin rektoru prof. C.Cəfərov çıxışında deyib: "Biz böyük Zəfər bayramı ərəfəsindəyik. Azərbaycanda çoxlu müxtəlif mərasimlər keçiririk. Bu günü qardaş Türkiyədəki Qazi Universitetində də qeyd edəcəyik. Türkiyə bir çox sahədə böyük uğurlar qazanıb. Qazi Universiteti Türkiyəni daha yaxşı gələcəyə aparan qurumlardan biridir. Bu gün bizi burada qəbul etdiyi üçün Qazi Universitetinə təşəkkür etmək istəyirəm. Universitetlərarası akademik əməkdaşlığın faydalı olmasını arzulayıram".

Onlayn proqramdan sonra Qazi Universitetinin tanıtım filmi nümayiş etdirilib. Filmin nümayişindən sonra nümayəndə heyətlərinin görüşü baş tutub. Protokolun imzalanma mərasiminin sonunda rektorlar bir-birinə xatirə hədiyyələri təqdim ediblər. Bundan əlavə, rektor prof. M.Yıldız Qazi Universitetinin meşəsalma işləri çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin nümayəndə heyətinin üzvlərinə fidan sertifikatı təqdim edib. Mərasim kollektiv xatirə şəklinin çəkilməsi ilə başa çatıb.

## REKTOR CƏFƏR CƏFƏROV TÜRKSOY-DA OLUB

İşgüzar səfər çərçivəsində Türkiyə Respublikasının paytaxtı Ankara şəhərində olan ADPU-nun rektoru professor Cəfər Cəfərov TÜRKSOY-da olub.

Onu müşayiət edən ADPU-nun akademik və idarəçilərindən ibarət nümayəndə heyəti ilə TÜRKSOY-un Baş Katibliyində olan Cəfər Cəfərovu TÜRKSOY-un Azərbaycan üzrə nümayəndəsi Elçin Qafarlı və əməkdaşları qarşılayıb. Konfrans zalında keçirilən görüşdə rektor C.Cəfərov TÜRKSOY-un gördüyü işlər haqqında məlumat alıb və bildirib ki, ötən il 100 illik yubileyini qeyd edən və bu günə kimi 160 mindən çox məzunu olan ADPU ilə Türk dünyasının ilk beynəlxalq təşkilatı olan TÜRKSOY arasında möhkəm əməkdaşlıq əlaqələrinin günü-gündən gücləndiyini söylədi. O, bu əməkdaşlığa mühüm töhfə kimi Azərbaycanda ilk dəfə və yalnız Pedaqoji Universitetdə açılan TÜRKSOY Mərkəzinin əhəmiyyətini vurğuladı.

Elçin Qafarlı təşkilatın Azərbaycanla bağlı fəaliyyətlərində ADPU-nun TÜRKSOY Mərkəzinin mühüm rola malik olduğunu vurğulayıb. ADPU-nun TÜRKSOY Mərkəzinin fəaliyyətə başladığı 2017-ci ildən indiyədək bir çox uğurlu işlərin həyata keçirildiyini qeyd edən Qafarlı qarşıdakı dövrdə bu əməkdaşlığın daha da artacağını vurğulayıb. E.Qafarlı qeyd edib ki, 2023-cü ildə Türkiyə Cümhuriyyətinin 100 illiyi,




Azərbaycanın ümmummilli lideri Heydər Əliyevin anadan olmasının 100 illiyi, TÜRKSOY-un 30 illiyi və Şuşanın 2023-cü ildə Türk Dünyasının Mədəniyyət Paytaxtı seçilməsi ilə bağlı ortaq layihələrin keçiriləcək. Görüş iki qurumun nəşr etdiyi yeni əsərlərin tərəflərə təqdim olunması ilə yekunlaşıb.

# QARŞILIQLI ƏLAQƏLƏR GENİŞLƏNDİRİLİR

## AZƏRBAYCAN SƏFİRLİYİ, ADPU VƏ QAZİ UNİVERSİTETİNİN BİRGƏ TƏŞKİLATÇILIĞI İLƏ "ŞUŞA BİZİMDİR! QARABAĞ BİZİMDİR! QARABAĞ AZƏRBAYCANDIR!" ADLI MƏRASİM KEÇİRİLİB

Azərbaycan Respublikasının Türkiyədəki Səfirliyi, ADPU və Qazi Universiteti Türk Dünyası Tətbiq və Araşdırma Mərkəzinin (TÜRKDAM) birgə təşkilatçılığı ilə Qarabağ zəfərinin ikinci ildönümü münasibətilə "Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!" adlı təntənəli mərasim keçirilib. 2020-ci il noyabrın 8-də Qarabağın rəmzi və türk dünyasının mədəniyyət paytaxtı olan Şuşanın işğaldan azad edilməsinin ildönümündə Qazi Universitetinin ev sahibliyi ilə rektorluğun Memar Kəmaləddin zalında keçirilən bayram mərasimi böyük maraqla qarşılanıb.

Azərbaycan Respublikasının Ankaradakı səfiri Rəşad Məmmədov, Səfirliyin təhsil müşaviri prof. Nəcibə Nəsibova, Qazi Universitetinin rektoru prof. Musa Yıldız, , Ankara Universitetinin rektoru prof. Necdet Ünüvar, Qazi Universitetinin keçmiş rektoru prof. Ənvər Həsənoğlu, ADPU-nun rektoru prof. Cəfər Cəfərov və prorektor dos. Eldar Aslanov, Qazi Universitetinin prorektoru prof. Yücel Gelişli, Təhsil və Xarici Əlaqələr Qurumunun Koordinatoru prof. İhsan Kalenderoğlu, TÜRKDAM direktoru prof. Alev Çakmakoğlu Kuru, direktor müavini prof. Bülent Aksoy, Baş katib prof. Ragıp Akyürek, baş katibin müavini Mehmet Ali Özkan, həmçinin dekanlar, alimlər, tələbələr və mətbuat nümayəndələri iştirak ediblər. Şəhidlərin xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi və hər iki qardaş ölkənin dövlət himnlərinin oxunması ilə başlayan mərasim Qarabağ Zəfərinə həsr olunmuş qısametrajlı filmin nümayişi ilə davam edib.

Açılış sözü ilə çıxış edən Qazi Universitetinin rektoru prof. M.Yıldız dedi: "Bu gün, noyabrın 8-də biz Azərbaycanın uzun illərdir Ermənistan Silahlı Qüvvələri tərəfindən işğal olunan torpaqlarını azad edərək böyük qələbə qazanmasını qeyd edirik. Türk birliyinin varlığını, türkün gücünü, türk şəxsiyyətini bütün dünyaya göstərdik. Türk milləti əsrlər boyu olduğu kimi, gələcəkdə də vətənini qorumaq üçün necə birləşəcəyini biləcək. Bu münasibətlə Qarabağ müharibəsində və ondan əvvəlki soyqırımlarda şəhid olan bütün türk qardaş və bacılarımıza Allahdan rəhmət diləyir, ay-ulduzlu Azərbaycan bayrağımızın vətənimizdə əbədi dalğalanmasını diləyirəm. Bu proqramın və sərginin hazırlanmasında əməyi keçən hər kəsə, başda Azərbaycanın Türkiyədəki Səfirliyi olmaqla ADPU-nun rektoru və nümayəndə heyətinə, Qazi Universiteti Türk Dünyası Tətbiq və Araşdırma Mərkəzinin direktoruna və sənətçi Ahmet Şafaka təşəkkürümü bildirirəm."



Zəfər Günündə Qazi Universitetində olmaqdan məmnunluğunu ifadə edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru prof. C.Cəfərov, – "Türkiyə Cümhuriyyəti və türk xalqı hər zaman Azərbaycanın yanında olub. Bu bizim birliyimizin, qardaşlığımızın gücüdür ki, hər zaman bir-birimizin yanındayıq. Biz Qazi Universiteti ilə gənclərimizi gələcəyə ən yaxşı şəkildə hazırlamaq üçün birlikdə hərəkət edəcəyik. Qazi Mustafa Kamal Atatürkün dediyi kimi, "Azərbaycanın sevinci sevincimiz, kədəri kədərimizdir". Bu bayram həm bizim bayramımızdır, həm də qardaş Türkiyənin bayramıdır." – dedi.

Ankara Universitetinin rektoru prof. N.Ünüvar bu özəl və mənalı günlə bağlı duyğu və düşüncələrini dilə gətirərək, "Biz sınaqlı bir coğrafiyanın övladları kimi böyümüşük, böyüyürük. Bu uzun və məşəqqətli yolun sonunda şükürlər olsun ki, 44 günlük müharibədən sonra Qarabağ öz azadlığını əldə etdi. Şuşada asan qələbə qazanılmadı. Minlərlə şəhidimiz, qazimiz var. Bu gün biz onların qan tökərək qələbə qazandıqları torpaqlarda qürurla bayram qeyd edirik. İki hörmətli rektorumuzun çox gözəl ifadə etdiyi kimi, biz akademik olaraq əcdadlarımızın qan tökərək qurtardığı torpaqları ancaq elm və texnika ilə tər tökərək gələcəyə daşıya bilərik." – dedi. Azərbaycan Respublikasının Türkiyədəki səfiri Rəşad Məmmədov deyib: "8 Noyabr – Zəfər Günü təkcə Azərbaycan xalqının bayramı deyil, bütün türk dünyasının ortaq zəfəridir. Bu müharibə təkcə Azərbaycanın deyil, bütün dünyada türk olduğunu hiss edən hər kəsin savaşı idi."

Açılış nitqlərindən sonra Şuşanın işğal illərində ermənilər tərəfindən dağıdılmış tarixi-mədəni abidələrdən və Qarabağ zəfərinin nəticələrindən bəhs edən elmi konfrans keçirilib. Qazi Universiteti TÜRKDAM direktoru prof. A. Çakmakoğlu Kuru "Türk dünyasının mədəniyyət paytaxtı azad Şuşada işğal illərinin izləri", ADPU-nun prorektoru dos. E.Aslanov isə "Vətən müharibəsi və onun nəticələri" mövzusunda məruzə ediblər. Müğənni Ahmet Şafak Qazi Universitetinin 28 il ərzində Qarabağ və Xocalı üçün etdiyi bütün tədbirlərdə istifadə etdoyi "Qarabağ" bəstəsinin hekayəsini danışıb. Mərasimə onlayn qatılan sənətçi "Qarabağ" mahnısını oxuyaraq dinləyicilərə duyğulu mesajlar verib. ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin professor-müəllim heyəti ilə Qazi Universiteti Qazi Təhsil Fakültəsi Musiqi Tədrisi kafedrasının professor-müəllim heyətinin birgə ifasında "Ortaq səsimiz: Çırpınırdın Qara dəniz" adlı kompozisiyanın təqdimi iştirakçılara emosional anlar yaşatdı. Sonra Qazi Universitetinin rektoru prof. M.Yıldız səfir R. Məmmədova, səfirliyin təhsil müşaviri prof. N.Nəsibovaya, ADPU-nun rektoru prof. C.Cəfərova, prorektor dos. E.Aslanova və Qazi Təhsil Fakültəsi İncəsənət təhsili şöbəsinin müəllimi prof. Türker Eroğluna plaketlər təqdim etdi.

Mərasimin sonunda Qazi Universitetinin Rektorluq binası qarşısında təşkil olunmuş prof. Mahirə Hüseynovanın şeirlərindən və Qarabağ zəfəri ilə bağlı fotoşəkillərindən ibarət sərgi ziyarət olundu. "Qarabağ Ağacı" kitabəsinin yerləşdirildiyi sərgi kollektiv xatirə fotoşəkilinin çəkilməsi ilə başa çatıb.

## ANKARA UNİVERSİTETİ İLƏ ƏMƏKDAŞLIQ PROTOKOLU İMZALANIB

ADPU ilə Türkiyənin Ankara Universiteti arasında akademik əməkdaşlıq protokolu imzalanıb.
ADPU-nun rektoru professor Cəfər Cəfərovun rəhbərlik etdiyi nümayəndə heyəti Türkiyədə işgüzar səfər çərçivəsində Ankara Universitetində olub, rektor prof. Necdet Ünüvarla görüşüblər. Daha sonra tərəflər arasında akademik və elmi mövzularda təcrübə mübadiləsini, professor-müəllim heyətinin və tələbələrin mübadiləsini, birgə elmi-tədqiqat layihələrinin və elmi görüşlərin təşkilini əhatə edən protokolun imzalanma mərasimi keçirilib. Ankara Universitetinin rektoru prof. N.Ünüvar təhsili həyatın əsas vəzifələrindən biri kimi gördüklərini ifadə edərək, "Təhsil hər şeyin başlanğıcıdır. Çünki etdiyimiz hər şey insanla bağlıdır. Ona görə də, insan yetişdirmək ən dəyərli vəzifələrdən biridir. İnşallah, Ankara Universiteti ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti arasında imzalanan protokol həm Türkiyə, həm Azərbaycan, həm də insanlıq üçün xeyirli işlər görməyə imkan verəcək". ADPU-nun rektoru prof. C.Cəfərov vurğulayıb ki, Qarabağın işğaldan azad edildiyi 44 günlük müharibə nəticəsində daha da möhkəmlənən Türkiyə-Azərbaycan dostluğu və qardaşlığı hər sahədə inkişaf etdirilməlidir. Prof. Cəfərov, – "Bu gün burada imzalayacağımız protokolun və bundan sonra görəcəyimiz işlərin həm universitetlərimizə, həm tələbələrimizə, həm ölkələrimizə, həm də bəşəriyyətə faydalı olacağına inanıram." – dedi. Daha sonra rektorlar akademik əməkdaşlıq protokolunu



imzalayıblar. İmzalanma mərasiminin sonunda qarşılıqlı hədiyyələr təqdim olunub və xatirə şəkli çəkdirilib.

Həmçinin rektor Ünüvar, Ankara Universitetində doktorluq təhsili alan Pedaqoji Universitetin prorektoru dos. Eldar Aslanova döş nişanı da təqdim edib.

## HACETTEPE UNİVERSİTETİ İLƏ ANLAŞMA MEMORANDUMU İMZALANIB

Pedaqoji Universitetin nümayəndə heyətinin Türkiyə Respublikasına işgüzar səfəri çərçivəsində növbəti görüş Hacettepe Universitetinin rəhbərliyi ilə keçirilib.

Əvvəlcə, heyətlərin tanışlıq görüşü keçirilib və əməkdaşlıq imkanları müzakirə olunub. Növbəti görüşdə isə ADPU nümayəndə heyəti Hacettepe Universitetinin Təhsil fakültəsində olub, burada təlim-tədris şəraiti ilə bağlı ətraflı məlumat alıblar. Görüşdə Pedaqoji Universitet tərəfindən Azərbaycanın Türkiyədəki səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova, ADPU-nun rektoru professor Cəfər Cəfərov, prorektorlar dosent Eldar Aslanov, Könül Pirverdiyeva, Filologiya fakültəsinin dekan müavini Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Hacettepe Universitetindən isə rektor prof. Mehmet Cahit Guran, prorektor prof. Vural Gökmen və Xarici əlaqələr şöbəsinin müdiri prof. Selim Latif Sanin iştirak ediblər. Məhsuldar görüşün yekununda rektorlar tərəfindən gələcək akademik və tələbə mübadiləsi, habelə elmi-pedaqoji əməkdaşlıq imkanlarını əhatə edən anlaşma memorandumu imzalanıb.



# TÜRK DÜNYASININ ALİ TƏHSİL OCAQLARI İLƏ ƏLAQƏLƏR İNKİŞAF EDİR

## ADPU QAZAXISTANDA BEYNƏLXALQ TƏRƏFDAŞLIQ PROQRAMINDA İŞTİRAK EDİB

ADPU "Müsəlman Dünyası ilə Ali Təhsil Dialoqu" proqramı çərçivəsində Qazaxıstan Milli Pedaqoji Universiteti (KazNPU) ilə "Pedaqoji Peşəkarlıq və Beynəlmiləlləşmə" adlı layihədə tərəfdaşlıq edir. ADPU-nun 6 nəfərdən ibarət nümayəndə heyəti "Pedagogical Professionalism and Internationalisation - Dialogue with the Post Soviet Islamic Education Space" proqramı çərçivəsində 5 - 13 oktyabr tarixlərində Qazaxıstanın Almatı şəhərində səfərdə olublar. Alman Akademik Mübadilə Xidməti (DAAD) tərəfindən maliyyələşdirilən layihə Almaniyanın FAU, Qazaxıstan Milli Pedaqoji Universiteti (Abay Universiteti) və ADPU arasında elmi-mədəni dialoq xarakteri daşıyır. 2020-2021-ci tədris ilindən icrasına başlanılan 3 illik layihə çərçivəsində ilk səfər 2022-ci ilin 24-31 may tarixlərində Almaniyanın Nürnberq şəhərinə baş tutmuşdur. Layihənin ikinci səfəri üçün proqram isə artıq iyul ayından qərara alınmışdır. Layihə çərçivəsində 8 gün davam edən Almatı səfərində ADPU Xarici Dillər Mərkəzinin müdiri dosent Ülviyyə Hacıyeva, mərkəzin müəllimləri Mirvari Qasımova, Jalə Səmədova, Təhsilin təşkili və idarə olunması ixtisasının magistrantı Gülnar Mirhüseynova, Filologiya fakültəsinin ingilis dili müəllimliyi ixtisasının




tələbəsi Nazakət Əliyarova, İbtidai təhsil fakültəsinin tələbəsi Səbinə Tağıyeva tərəfindən təmsil olunub. Təmsilçilər beynəlmiləlləşmə, beynəlxalq təhsil mövzularında keçirilən seminarlarda iştirak edib və təqdimatlar hazırlayaraq 3 ölkənin nümayəndələri ilə müzakirələr aparıblar.

Bu ilin yekunu olaraq təşkili nəzərdə tutulan "Dual Models of Training of Future Pedagogical Professionals in the International Educational Space: Problems, Solutions, and Prospects" adlı Beynəlxalq Konfrans isə 11-12 oktyabr tarixlərində keçirilib və iştirakçılar burada məqalə ilə çıxış ediblər.

## ÖZBƏKİSTANIN TERMİZ DÖVLƏT UNİVERSİTETİNİN NÜMAYƏNDƏ HEYƏTİ ADPU-DA OLUB

Özbəkistanın Termiz Dövlət Universitetinin prorektoru Obidcan Şəfiyevin rəhbərliyi ilə doktorantura, magistratura və bakalavr pilləsində təhsil alan tələbələrdən ibarət nümayəndə heyəti ADPU-da olub. Nümayəndə heyəti ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova ilə görüşüblər. Görüşün əsas məqsədi Özbəkistan və Azərbaycanın ali təhsil sistemində təcrübə mübadiləsi aparmaq, elmi əlaqələr qurmaq, tələbə həyatı ilə yaxından tanış olmaqdır.

Görüş zamanı türkdilli dövlətlərin ali təhsil müəssisələri arasında əməkdaşlıq əlaqələrinin genişləndirilməsinin vacibliyi vurğulanıb və ortaq təhsil sahəsində əməkdaşlıq perspektivləri müzakirə olunub.



Daha sonra qonaqlar ADPU-nun binası, kitabxanası və dərs auditoriyaları ilə tanış olublar. Qeyd edək ki, səfər çərçivəsində Termiz Dövlət Universitetinin nümayəndələri ADPU-nun Quba filialını da ziyarət edəcəklər.

## TERMİZ DÖVLƏT UNİVERSİTETİNİN NÜMAYƏNDƏLƏRİ ADPU-NUN QUBA FİLİALINI ZİYARƏT EDİBLƏR

Özbəkistanın Termiz Dövlət Universitetinin prorektoru Obidcan Şəfiyev, həmin universitetin əməkdaşları və tələbələri ADPU-nun Quba filialını tanışlıq və əməkdaşlıq əlaqələrinin yaradılması məqsədilə ziyarət ediblər. Səfər zamanı qonaqları ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru f.ü.e.d., professor Mahirə Hüseynova, dosent, Filologiya fakültəsinin elmi işlər üzrə dekan müavini Könül Həsənova, p.ü.f.d., Filologiya fakültəsinin dekan müavini Pəri Paşayeva, p.ü.f.d., dosent Fəxrəddin Yusifov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və şöbənin baş mütəxəssisi Nurəngiz Mahmudova müşayiət edib. ADPU-nun Quba filialının direktoru dos.Yusif Əliyev tədbiri giriş sözü ilə açaraq tədbir iştirakçılarını və Özbəkistan təhsil ictimaiyyətinin nümayəndələrini salamlayıb. O, filialın elm və təhsil üzrə beynəlxalq əlaqələrin qurulması sahəsində ilk addımlarını atdığını qeyd edərək bu şəraiti yaratdığına görə ADPU rəhbərliyinə minnətdarlığını bildirib.

Daha sonra Özbəkistan və Azərbaycan Respublikalarının dövlət himnləri səsləndirilib və özbəkistanlı tələbələrin ifasında Qarabağ və digər Azərbaycan mahnıları dinlənilib.

Tədbirdə prorektor prof. Mahirə Hüseynova, tanınmış şair Ramiz Qusarçaylı, Quba filialının



baş müəllimi Eyvaz Şeydayev çıxış ediblər. Çıxış edənlər hər iki qardaş türk xalqının eyni kökdən gəldiyini, birsoylu dilimizin, ortaq tariximizin, dinimizin, adətlərimizin olduğunu qeyd ediblər və tarixə nəzər salaraq ədəbiyyatşünaslıq, dilçilik, kənd təsərrüfatı və sənaye sahəsində uzunillik əməkdaşlığın mövcudluğundan danışıblar. Tədbirin sonunda çıxış edən Obidcan Şəfiyev özbək tələbələrin dünya ədəbiyyat xəzinəsinə böyük töhfələr vermiş Nizami Gəncəvi, Füzuli kimi dahi Azərbaycan şairlərini və müasir azərbaycanlı ədibləri sevərək oxuduqlarını, onların Azərbaycan musiqi və muğamlarını dinlədiklərini, özbək xalqının 44 günlük Vətən müharibəsi zamanı qardaş Azərbaycan xalqının yanında olduğunu, uğurlarına sevindiyini qeyd edib və ədəbi-mədəni əlaqələrimizdən danışıb.

## BAŞKENT UNİVERSİTETİ İLƏ ƏMƏKDAŞLIQ MÜQAVİLƏSİ

ADPU nümayəndə heyətinin Türkiyə Respublikasına işgüzar səfəri çərçivəsində qardaş ölkənin Başkent Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanıb.



Görüşdə ADPU tərəfindən Azərbaycanın Türkiyədəki səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova, universitetin rektoru professor Cəfər Cəfərov, prorektorlar dosent Eldar Aslanov, Könül Pirverdiyeva, Filologiya fakültəsinin dekan müavini Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Başkent Universitetindən isə rektor vəkili İ.Haldun Müderrisoğlu, Eğitim İnstitutunun direktoru prof. Servet Özdemir, Təhsil fakültəsinin dekanı Sadegül Akbaba və prof. Burhaneddin Dönmez iştirak ediblər. Görüşdə Azərbaycan və Türkiyə ali təhsil müəssisələri arasında geniş əməkdaşlıq imkanlarından söz açılıb və gələcək əməkdaşlığın hər iki ali təhsil ocağına faydalı olacağı, təcrübə mübadiləsində önəmli rol oynayacağı vurğulanıb.

Daha sonra rektorlar tərəfindən universitetlər arasında əməkdaşlıq müqaviləsinin imzalanma mərasimi keçirilib.

Görüşün yekununda prof. C.Cəfərov Başkent Universitetinin xatirə kitabına ürək sözlərini qeyd edib.

## ADPU İLƏ TED UNİVERSİTETİ ARASINDA ƏMƏKDAŞLIQ İMKANLARI MÜZAKİRƏ OLUNUB

ADPU nümayəndə heyətinin Türkiyə Respublikasına işgüzar səfəri çərçivəsində qardaş ölkənin TED Universiteti ziyarət olunub və ali təhsil müəssisələri arasında əməkdaşlıq imkanları müzakirə olunub. Görüşdə ADPU-nu Azərbaycanın Türkiyədəki səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova, rektor professor Cəfər Cəfərov, prorektorlar dosent Eldar Aslanov, Könül Pirverdiyeva, Filologiya fakültəsinin dekan müavini Könül Həsənova və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova təmsil ediblər. TED Universitetinin rektoru professor İhsan Sabuncuoğlu və universitetin Təhsil fakültəsinin dekanı professor Yüksel Kavakla cari ilin iyun ayında ADPU-da ali təhsil müəssisələri arasında imzalanan əməkdaşlığa dair anlaşma memorandumundan irəli gələn məsələlər və hər iki qurumun müvafiq strukturları arasında əməkdaşlıq mexanizmləri müzakirə olunub. Ziyarət çərçivəsində, həmçinin, TED Universitetinin Təhsil fakültəsinin əməkdaşları ilə fikir mübadiləsi aparan ADPU heyəti fakültədə yaradılan şərait və təlim mühiti ilə yaxından tanış olublar. Bu görüşdən bir müddət sonra isə TED Universitetinin rektoru professor İhsan Sabuncuoğlu Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olub.

Tərəflər Ankarada keçirilən görüşün davamı olaraq ali təhsil müəssisələri arasında tədqiqat və akademik istiqamətlərdə əməkdaşlıq mexanizmlərinin qurulması yollarını müzakirə ediblər.





## DR. NİHAT BÖYÜKBAŞ QUBA FİLİALININ TƏLƏBƏLƏRİ ÜÇÜN SEMİNAR KEÇİB




ADPU-nun Quba filialında "Təhsil sistemləri və layihələrin idarə edilməsi" fənni üzrə "Azərbaycan və Türkiyə təhsil sistemlərinin müqayisəli təhlili" mövzusunda keçirilən seminar-dərsə Türkiyə Respublikasının Təhsil Nazirliyinin mütəxəssisi, Azərbaycanda təhsil müşaviri vəzifəsində çalışmış Dr. Nihat Böyükbaş dəvət olunmuşdur. Filialın müəllimi, Qazi universitetinin doktorantı Şəhla İbişova tədris etdiyi fəndə dərslərə müntəzəm qaydada mövzuya uyğun olaraq Türkiyənin təhsil sahəsində çalışan alim və mütəxəssisləri dəvət olunur.

Dr. Nihat Böyükbaş Türkiyədə həyata keçirilən müasir təhsil islahatları ilə Azərbaycanın təhsil uğurlarını müqayisəli paralellərlə təhlil edərək tələbələrin bu mövzu ilə əlaqəli suallarını cavablandırmışdır. Onlayn dərsdə filialın direktoru dosent Yusif Əliyev, müəllimlər və tədris şöbəsinin əməkdaşları iştirak etmişdir.

## REKTOR MAGİSTRANTLAR ÜÇÜN USTAD DƏRSİ KEÇİB



Rektor prof. Cəfər Cəfərov "Təhsilin təşkili və idarə edilməsi (MBA)" ixtisaslaşmasında təhsil alan magistrantlar üçün "ADPU-da strateji idarəetmənin xüsusiyyətləri" mövzusunda ustad dərsi keçib.

Əvvəlcə ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov və Tədris departamentinin direktor müavini dosent Ənvər İmanov ADPU-da strateji planlama və idarəetmə fəaliyyəti haqqında ümumi məlumat verərək, təhsil liderlərinin hazırlanmasının universitetin əsas hədəflərindən olduğunu diqqətə çatdırmış, məhz bu məqsədlə yaradılan Təhsil menecmenti kafedrasında müasir təhsil idarəçiliyi və təhsilin biznes əsasları ilə bağlı müasir təlim kurslarının hazırlanaraq tədris olunduğunu qeyd ediblər.

"Təhsildə strateji idarəetmə" fənni üzrə dərs-görüşdə magistrantlar üçün ustad dərsi keçən prof. C.Cəfərov ADPU-da tətbiü olunan strateji bə optimal idarəetmə mexanizmi haqqında geniş məlumat vermiş, növbəti illər üçün universitetin strateji planının əsas konturları haqqında maraqlı məqamları açıqlamışdır.

Magistrantlar tərəfindən maraqla qarşılanan master-klassda universitetdə strateji planlaşdırma və risk idarəetməsi, yeniliklərin optimal tətbiqi ilə bağlı çoxsaylı suallar ünvanlanmış, suallar ətrafında geniş müzakirə aparılmış, təkliflər dinlənilmişdir. Qeyd edək ki, ADPU-da yeni nəsil təhsil liderlərinin hazırlanması strategiyasına uyğun olaraq, "Təhsilin təşkili və idarə edilməsi (MBA)" ixtisaslaşmasında təhsil alan magistrantlar üçün mütəmadi olaraq, ADPU-da, Pedaqoji Kollecdə, baza məktəbində, 132-134 saylı təhsil kompleksində, Britaniya-Azərbaycan Məktəbi kimi təhsil müəssisələrində təhsilin bütün pillə və səviyyələri üzrə akademik və inzibati heyətlə praktik görüşlər və seminarlar keçirilir.

## BRİTANİYA ŞURASININ NÜMAYƏNDƏLƏRİ ADPU-NUN QONAĞI OLUB

Oktyabrın 27-də Britaniya Şurasının (BŞ) Azərbaycan Respublikası üzrə direktoru Nərgiz Hacıyeva və Şuranın imtahanlar üzrə meneceri Nərgiz Əkbərova ADPU-nu ziyarət ediblər.



Görüşdə ADPU-nu rektor professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, beynəlxalq əlaqələr üzrə prorektor professor Mahirə Hüseynova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və şöbənin mütəxəssisi Rufanə Əhmədova təmsil ediblər.

Görüş zamanı rektor ADPU-nun tarixi, strukturu, təhsil proqramları barədə məlumat verib və gələcəkdə Britaniya universitetləri ilə də əlaqələrin yaradılmasının universitetin beynəlxalq əlaqələri baxımından əhəmiyyətli olduğunu da qeyd edib. BŞ-nin Azərbaycan direktoru N.Hacıyeva da öz növbəsində Şuranın Azərbaycandakı fəaliyyəti, həyata keçirdiyi tədbirlər, proqramlar haqqında universitet rəhbərliyini məlumatlandırıb.

Eyni zamanda, Britaniya Şurası tərəfindən həm müəllimlərin, həm də tələbələrin ingilis dili biliyinin qiymətləndirilməsi üçün müxtəlif proqramların mövcudluğu qeyd olunub və bu sahədə əməkdaşlıq imkanları müzakirə edilib. Sonda qonaqlara hədiyyələr təqdim olunub.

## DR. MARIA CSEH "TƏŞKİLATİ İNKİŞAF" MÖVZUSUNDA SEMİNAR KEÇİB



Oktyabrın 21-də ADPU-da ikili diplom proqramı üzrə əməkdaşlıq olunan ABŞ-nin Corc Vaşinqton Universitetinin (CVU) müəllimi dr. Maria Cseh "Təşkilati inkişaf" mövzusunda seminar keçib.

Qonağı əməkdaşlara təqdim edən ADPU-nun rektoru professor Cəfər Cəfərov bildirib ki, ADPU-CVU ikili diplom proqramı çərçivəsində CVU-nun akademik potensialından daha faydalı istifadə etmək üçün proqram müəllimləri ilə ADPU əməkdaşlarının bu tip müntəzəm görüşlərinin təşkili nəzərdə tutulur.

"Təşkilati inkişaf və dəyişikliklər" mövzusunda təqdimat edən dr. M.Cseh qeyd edib ki, dəyişikliklər adətən, narahatedicidir, lakin bu bizim üçün inkişaf səbəbidir. Bununla belə, inkişaf və dəyişikliyin fərqini ayırd etmək lazımdır. İnkişafda dayanıqlılıq və davamlılıq önəmlidir.

Spiker qeyd edib ki, təşkilatda planlı dəyişiklik etmək üçün dörd ardıcıl mərhələ icra olunmalıdır: başlamaq və hüquqi əsas; diaqnostika; planlama və tətbiq; qiymətləndirmə və möhkəmləndirmə.

Təqdimatda qeyd olunub ki, eyni zamanda əməkdaşların təşkilatların inkişafı üçün qərarvermədə iştirak etmək trendi son vaxtlar aktualdır və bu düzgün idarə olunarkən faydalı prosesdir. Burada prosesə liderlik etməyin də önəmi ortaya çıxır və bu baxımdan liderlərin hazırlanması və dünyagörüşü olduqca vacib məsələdir.

## POLİS AKADEMİYASININ PEDAQOJİ HEYƏTİ ÜÇÜN TƏLİM KURSU KEÇİRİLİB




Oktyabrın 20-də Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin Polis Akademiyasında ADPU-nun təlimçiləri tərəfindən bu təhsil müəssisəsinin pedaqoji heyəti üçün təşkil olunan təlimlərin bağlanış və təltifetmə mərasimi keçirilib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, ümimi işlər üzrə prorektor Tural Cəlilov, Magistratura və doktorantura şöbəsinin müdiri, s.e.ü.f.d. Rəşad Sadıqov, Davamlı təhsil və innovasiyalar bölməsinin müdiri dosent Polad Mədədov, həmin bölmənin baş mütəxəssisləri Dilguşə Süleymanova və Fəridə Hüseynova, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının baş müəllimi, p.ü.f.d. Gülşən Eminova və Akademiyanın rəhbər və pedaqoji heyəti iştirak ediblər. Açılış sözü ilə çıxış edən Polis Akademiyasının rəisi, polis general-mayoru Canpolad Daanov 100 illik tarixi olan Akademiyanın uğurlarından, həyata keçirilən tədbirlərdən danışaraq ADPU ilə əlaqələrin qurulmasının əhəmiyyətindən danışmışdır. Hər iki təhsil ocağının rəhbərləri əməkdaşlıqlarından məmnunluq duyduqlarını qeyd edərək əməkdaşlıqlarının davamlı olacağını vurğulamışlar.

Qeyd edək ki, ADPU-nun təlimçiləri tərəfindən 06.12.2021-23.06.2022-ci il tarixlərdə Polis Akademiyasının pedaqoji heyəti üçün ödənişli əsaslarla əyani formada "Müəllim hazırlığının müasir problemləri" adlı 42 saatlıq təlim təşkil edilmişdir. Yekunda təlimdə iştirak edən nəfər 51 nəfər müdavim kursu uğurla başa vurmuşdur.

## GƏNCLƏR VƏ İDMAN NAZİRİ ŞƏKİ FİLİALININ TƏLƏBƏLƏRİ İLƏ GÖRÜŞÜB



Görüşdə gənclərin asudə vaxtının təşkili üçün imkanlar, Tələbə Gənclər Təşkilatının fəaliyyəti, qeyri-formal təhsil alətlərinin tətbiqi, tələbələrin dərsdən sonrakı məşğulluğu, idman oyunlarının keçirilməsi və s. mövzularda tələbələrin fikirləri, çətinlikləri və təklifləri dinlənilib.

Görüşdə nazir müavini Marina Vasilieva və Gənclərlə iş şöbəsinin müdiri Fuad Babayev iştirak ediblər. Qeyd edək ki, "Gənclərlə dialoq platforması" layihəsi çərçivəsində gənclər və idman naziri Fərid Qayıbov gənclər təşkilatları, tələbələr, həmçinin regionlarda yaşayan gənclərlə müntəzəm görüşləri keçirilir. Görüşlərin əsas məqsədi gəncərlə fikir mübadiləsi aparmaq və onların qarşılaşdıqları çətinliklərinin birgə həll yollarını müəyyən etməkdir.

## GƏNCLƏR VƏ İDMAN NAZİRİ AĞCABƏDİ FİLİALININ TƏLƏBƏLƏRİ İLƏ GÖRÜŞÜB



Oktyabrın 21-də Azərbaycan Respublikasının gənclər və idman naziri Fərid Qayıbov ADPU-nun Ağcabədi filialının tələbələri ilə görüşüb.

Görüşdə gənclər və idman nazirinin müavini Mariana Toteva Vasileva, Nazirliyin Gənclərlə İş Şöbəsinin müdiri Fuad Babayev, Ağcabadi rayon Gənclər və İdman İdarəsinin rəisi Rüfət Quliyev də iştirak edib.

Filialın direktoru Mobil Məcidov müəllim-tələbə heyəti adından naziri salamlayaraq, təhsil ocağına gəldiyi üçün təşəkkür edib və bu görüşün gənclər üçün faydalı olacağını bildirib.

Görüşdə Fərid Qayıbov gəncləri dinləyib, onların təklif və arzuları ilə maraqlanıb. Tələbələr öz uğurları və fəaliyyətləri barədə danışıb, nazirə müxtəlif mövzularda suallar veriblər. Region gəncləri üçün nazirliyin layihələri haqqında məlumat verilib.

Görüşdə filialın tələbə-gənclər təşkilatı ilə rayon Gənclər və İdman İdarəsi arasında əlaqələrin gücləndirilməsi, müxtəlif təşəbbüslərin birgə həyata keçirilməsi, gənclərin sosial fəaliyyətlərə daha çox cəlb edilməsi və vətənpərvərlik istiqamətlərində fikir mübadiləsi aparılıb.

# Əhməd Cavad - 130

## İSTİQLAL ŞAİRİ – ƏHMƏD CAVAD



Oktyabrın 11-də ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) təşkilatçılığı ilə böyük Azərbaycan şairi, Azərbaycan himninin sözlərinin müəllifi Əhməd Cavadın anadan olmasının 130 illiyinə həsr edilmiş "İstiqlal şairi - Əhməd Cavad" adlı görüş keçirilib. Universitetin Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli və ADPU TGT sədri Təhmasib İmaməliyev tələbələri salamlayaraq Əhməd Cavadın 130 illiyinin qeyd edilməsi ilə bağlı Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən Sərəncam imzalandığını və dahi sənətkarın yubileyinin bütün ölkə üzrə yüksək səviyyədə qeyd olunduğunu, onun yaradıcılığının gənclərə aşılanmasının vacibliyini qeyd ediblər. Görüşdə gənc tədqiqatçı Dilqəm Əhməd tələbələrə Əhməd Cavadın zəngin yaradıcılığı və keşməkeşli həyat və yaradıcılıq yolundan söz açmış, şairin həyat yoldaşı Şükriyyə xanımın çətin sürgün həyatından danışmışdır. Tədqiqatçı Əhməd Cavadın milli dövlətçilik tariximizdə oynadığı müstəsna rola diqqət çəkmişdir. Görüş tələbələrin sualları ətrafında müzakirələrlə davam etdirilmişdir.

## ƏHMƏD CAVADIN 130 İLLİYİNƏ HƏSR OLUNMUŞ TƏDBİR



Noyabrın 24-də ADPU-nun Ağcabədi filialında görkəmli Azərbaycan şairi və ictimai xadimi Əhməd Cavadın anadan olmasının 130 illik yubiley tədbiri keçirildi. Tədbiri giriş sözü ilə açan filialın direktoru dosent Mobil Məcidov Azərbaycan dövlətçiliyi və ədəbiyyatı tarixində milli istiqlal şairi kimi tanınan Əhməd Cavadın yüksək vətənpərvərlik qayəsindən, xalqa, dövlətçiliyimizə sədaqətindən danışaraq qeyd etdi ki, Ə.Cavad M.F.Axundzadə, H.Zərdabi, M.Ə.Rəsulzadə, Ə.Topçubaşov, C.Məmmədquluzadə, M.Ə.Sabir, M.Hadi, H.Cavid və başqaları ilə başlayan Azərbaycan milli istiqlal ideyası və türkçülük məfkurəsinin davamçısıdır. Onun adının milli azadlıq və istiqlal ideyaları ilə möhkəm bağlılığının nəticəsidir ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 20 aprel 2022-ci il tarixində görkəmli sənətkarın anadan olmasının 130 illiyinin Respublika səviyyəsində qeyd edilməsi ilə bağlı Sərəncam imzalayıb. Filialın "Dillər, ədəbiyyat və onların tədrisi texnologiyası" kafedrasının müdiri dos. Vaqif Allahverdiyev Əhməd Cavadın şərqdə ilk cümhuriyyət olan Azərbaycan Xalq Cümhuriyyətinin milli dövlət himninin müəllifi kimi xalqın mənəvi yaddaşında əbədi yaşayacağına əminlik hissi ifadə etdi. Sonra söz məruzəçilərə verildi. Dos. Mətanət Fərzəliyeva "Əhməd Cavadın yaradıcılıq yolu", gənc müəllim Maya Abdullayeva isə "Əhməd Cavadın dövrü və həyatı" mövzusunda məruzə etdilər. Məruzələr dinlənildikdən sonra filialın Pedaqoji fakültəsinin bir qrup tələbəsi, o cümlədən Nəzrin Şirinova, Lalə Mahmudova, Mədinə Nağıyeva, Aytən Hüseynli, Sevinc Allahyarova, Nuranə Zeynalova, Aysu Teymurova və Fidan Hüseynovanın təqdimatında şairin yaradıcılığından lirik nümunələr və sözlərinə bəstələnmiş nəğmələr səsləndirildi.

## KONFRANS: İSTİQLAL ŞAİRİ ƏHMƏD CAVAD




Noyabrın 18-də ADPU-nun Şəki filialında görkəmli Azərbaycan şairi Əhməd Cavadın anadan olmasının 130 illiyi münasibətilə "İstiqlal şairi Əhməd Cavad" adlı elmi-nəzəri konfrans keçirilib. Konfransda filialın professor-müəllim heyəti və tələbələri iştirak ediblər. Tədbiri giriş sözü ilə filialın tədris işləri üzrə direktor müavini dosent Gülarə Abdullayeva açaraq, Əhməd Cavadın Azərbaycan ədəbiyyatı tarixində mövqeyindən bəhs edib. Qeyd olunub ki, Azərbaycanın dövlət himninin sözlərinin müəllifi olan Əhməd Cavad vətənpərvər, azadlıq ruhlu şeirləri ilə xalqımızın yaddaşında əbədiləşib, istiqlal şairi kimi tanınıb və həmişə sevilib.

Konfransda filialın Humanitar fənlər kafedrasının müdiri, tar.ü.f.d., baş müəllim Vüsal Baxışov "XX əsrin əvvəllərində Azərbaycanda ictimai-siyasi vəziyyətin Əhməd Cavad poeziyasına təsirləri və onun izləri", həmin kafedranın əməkdaşları: baş müəllim, şair Vaqif Aslan "Əhməd Cavadın yaradıcılıq yolu", dosent Kamil Adişirinov "Əhməd Cavadın folklor görüşləri", filialın filologiya fakültəsinin III tədris ili tələbəsi Xədicə Şərifli "Əhməd Cavad yaradıcılığında Vətən mövzusu" mövzusunda məruzələrlə çıxış ediblər. Konfransa hazırlıq məqsədilə Türkan Mirzəyevanın rəhbərliyi ilə filialın kitabxanası şairə həsr edilmiş stend hazırlamışdır.

## "ƏHMƏD CAVAD - XALQIN HAQQ BAĞIRAN SƏSİ" MÖVZUSUNDA USTAD DƏRSİ



ADPU-nun Quba filialında Əhməd Cavadın 130 illik yubileyinə həsr edilən "Əhməd Cavad - Xalqın haqq bağıran səsi" mövzusunda ustad dərsi keçirilib. Filialın Ədəbiyyat və dillər kafedrasının müəllimi Günəş Xudayarovanın təşkilatçılığı ilə Azərbaycan dili və ədəbiyyat müəllimliyi ixtisasının III tədris ili tələbələri ilə keçirilən dərsdə sözlərinin müəllifi Əhməd Cavadın olduğu Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. Daha sonra tələbələrin hazırladıqları təqdimatlar əsasında şairin həyat və yaradıcılığı, uğradığı haqsızlıqlar, yazdığı şeirlər, lirik və satirik əsərlər, şeirlərinə bəstələnən musiqilər səsləndirilib, şairin həyatından müəyyən məqamlar səhnələşdirilib, şair haqqında yazılan əsərlərdən ibarət kitablar təqdim olunub.

## MASTER-KLASS: GƏLƏCƏYİN MÜƏLLİMİ

ADPU-da 5 Oktyabr – Beynəlxalq Müəllimlər Gününə həsr olunmuş "Gələcəyin müəllimi" mövzusunda interaktiv tədbir keçirilib. Tədbir iştirakçıları əvvəlcə ümummilli lider Heydər Əliyevin ali təhsil ocağının foyesindəki abidəsini ziyarət ediblər. Universitetin yüksək göstəricili yuxarı kurs tələbələri və ADPU-nun baza məktəbi olan 7 nömrəli tam orta məktəbin X-XI sinif şagirdlərinin iştirakı ilə keçirilən tədbirdə açılış sözü ilə çıxış edən rektor professor Cəfər Cəfərov qonaqları və tədbir iştirakçılarını salamlayaraq əlamətdar bayram münasibəti ilə təbrik edib. Rektor vurğulayıb ki, gələcəyin müəllimi olmaq qabaqlayıcı və qeyri-standart düşünmə ilə başlayır. Prof. C.Cəfərov deyib: "Yaşadığımız əsrdə elm, təhsil və texnologiyalar misli görünməmiş sürətlə inkişaf edir. Belə şəraitdə Pedaqoji Universitet, ümumilikdə ölkə olaraq yüksəkixtisaslı, müasir dünyagörüşlü, milli dəyərlərə sadiq müəllim kadrlarının hazırlanmasını təmin etmək əsas məqsədimizdir. Bu məqsədə çatmaq üçün 3 strateji inkişaf xəttini diqqətinizə çatdırmaq istərdim: təhsilalanlara Vətən, dövlət və tarix sevgisinin aşılanması; təhsilalanların öz ölkəsinin tərəqqisinə xidmət etməsi; təhsilalanlara rəqəmsal biliklər və xarici dil bacarıqlarının verilməsi

Təsadüfi deyil ki, bütün bu keyfiyyətlər Avropa Şurası tərəfindən, habelə 2020-ci ildə qəbul edilən "Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları"nda XXI əsr səriştə və bacarıqları kimi qeyd olunur." Tələbə və şagirdlər üçün master-klass formatında təşkil olunan tədbirdə Azərbaycan Respublikası Təhsil İnstitutunun (ARTİ) İnsan Resursları Mərkəzinin direktoru Nurlan İsmayılbəyli "Müəllimlərin işə qəbulu", ADPU məzunu, 214 nömrəli tam orta məktəbin direktoru Fəttah Fəttayev "Peşəkar həyatın başlanğıcı", ADPU-nun müəllimi, psixoloq Gülər Məmmədova "Fərqindəlik və motivasiya" və ADPU-nun məzunu, ictimai fəal, İsmayıllı rayonunda fəaliyyət göstərən gənc müəllim Ülvi Şamilov isə "Sosial-ictimai aktivliyin müəllimlikdə rolu" mövzularında təqdimatla çıxış etmiş, öz peşəkar təcrübələrini bölüşmüşlər.

Mövzular üzrə maraqlı diskussiya ilə davam edən tədbirdə tələbə və şagirdlərin fikirləri dinlənilmiş, sualları cavablandırılmışdır.



## ADPU FRANSADA KEÇİRİLƏN ERASMUS+ TƏLİM PROQRAMINDA İŞTİRAK EDİB

3-7 oktyabr tarixlərində Fransa Respublikasının paytaxtı Parisdə Bakı Biznes Universitetinin koordinatorluğu və Avropa Komissiyasının maliyyə dəstəyi ilə həyata keçirilən "Azərbaycanda Rektorlar Konfransının yaradılması" adlı Erasmus+ layihəsini əhatə edən "Ali təhsil sisteminin inkişafında rektorlar konfransının rolu" adlı təlim proqramı keçirilib. Təlim proqramında Azərbaycan Respublikası Elm və Təhsil nazirinin müşaviri, Azərbaycan universitetlərinin rektor və prorektorları, o cümlədən digər səlahiyyətli universitet nümayəndələri iştirak ediblər. Təşkilatın Təhsil Əməkdaşlığı Departamentinin direktor müavini Bruno Kurval layihə çərçivəsində əməkdaşlığın uğurla davam etdiyini və təlim proqramının əhəmiyyətini vurğulayıb. Tədbirə onlayn formatda qatılan Rennes Universitetinin prezidenti David Alis "Rektor konfranslarında komitələrin rolu və fəaliyyəti" mövzusunda geniş təqdimatla çıxış edib.

Təlim proqramında ADPU-nun tədris işləri üzrə prorektoru



dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Filologiya fakültəsinin elmi işlər üzrə dekan müavini Könül Həsənova da iştirak ediblər.

## ADPU VIII BAKI BEYNƏLXALQ KİTAB SƏRGİSİNDƏ UĞURLA TƏMSİL OLUNUB

ADPU 5-9 oktyabr 2022 il tarixlərində Bakı Ekspro Mərkəzində keçirilən VIII Bakı Beynəlxalq Kitab Sərgisində təmsil olunub. Pedaqoji Universitetin stendində universitetin 100 illik yubileyi ilə bağlı nəşr olunmuş silsilə kitablarla yanaşı professor-müəllim heyətinin müəllifləri olduqları monoqrafiya, dərslik, dərs vəsaitləri və tədqiqat əsərləri, həmçinin universitetin dövri-elmi nəşrləri də nümayiş etdirilib. Sərgidə ADPU-nun stendinə maraq olduqca çox olub. Respublikanın tanınmış ziyalıları, xarici ölkə nümayəndələri, kitabsevərlər stendlə yaxından tanış olmuş, onlara universitetin keçdiyi tarixi yol haqqında geniş məlumat verilmiş, ziyarətçilərə universitet haqqında məlumat nəşrləri hədiyyə olunmuşdur. Qeyd edək ki, universitetin stendini ziyarət edən dünyaca məşhur türk tarixçisi




İlbər Ortaylı ADPU-nun tarixi ilə bağlı nəşrləri yüksək qiymətləndirib. ADPU beynəlxalq kitab sərgisində uğurlu iştirakına görə sertifikatla təltif edilmişdir.

## POLKOVNİK ŞAİR RAMALDANOVLA GÖRÜŞ



`Oktyabrın 14-də ADPU SABAH qruplarının Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı ilə Azərbaycan Silahlı Qüvvələrinin Hərbi Akademiyasının təlim-tədris hissəsinin sabiq rəisi və akademiyanın sabiq rəis müavini, ehtiyatda olan polkovnik, tanınmış hərbi ekspert Şair Ramaldanovla "Hibrid müharibə" mövzusunda tələbələrin görüşü keçirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev hərbi ekspert, peşəkar mütəxəssis kimi Şair Ramaldanovun Azərbaycan Silahlı Qüvvələrindəki misilsiz xidmətlərindən, həyatı və fəaliyyətindən bəhs etmiş, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov isə səriştəli zabit kimi Ş.Ramaldanovun I Qarabağ müharibəsində strateji əhəmiyyətli bir sıra hərbi əməliyyatlara rəhbərlik etməsini vurğulayaraq, gənclərimizin məhz bu cür şəxsiyyətlərin təcrübələrindən bəhrələnmək üçün can atmalarını olduqca təqdirəlayiq hal kimi qiymətləndirib. Polk. Ş.Ramaldanov I Qarabağ və Vətən müharibələri haqqında danışaraq, artıq 44 günlük savaşda əvvəlki müharibədən fərqli olaraq Azərbaycan Ordusunun Silahlı Qüvvələrin Müzəffər Ali Baş Komandanı cənab İlham Əliyevin sərkərdəliyi ilə və müdrik xarici siyasət kursu ilə öz doğma torpaqlarını düşmən işğalından azad etdiyini diqqətə çatdırıb. Hərbi qələbənin siyasi, iqtisadi, informasiya dayaqlarının yüksək səviyyədə olması, xalq-dövlət-ordu birliyinin mükəmməl modelinin Azərbaycanı tarixi zəfərə apardığını qeyd edən polkovnik tələbə-gənclərdə vətənpərvərlik və vətəndaşlıq hisslərinin yüksək səviyyədə olduğunu, Azərbaycan gəncləri ilə qürur duyduğunu deyib.

## MÜSTƏQİLLİYİN BƏRPASI GÜNÜ QEYD OLUNDU




Filologiya fakültəsində 18 Oktyabr - Müstəqilliyin Bərpası Gününə həsr edilmiş "Can Azərbaycan" adlı tədbir keçirilib. Tədbirdə universitet və fakültə rəhbərliyi, habelə fakültənin professor-müəllim və tələbə heyəti, ADPU-da təhsil alan əcnəbi tələbələr iştirak etmişdir.

ADPU-nun rektoru professor Cəfər Cəfərov açılış nitqi ilə çıxış edərək Müstəqilliyinin Bərpası Gününün böyük tarixi əhəmiyyətinə toxunaraq, 1918-ci ildə öz dövlət müstəqilliyini elan edən müasir Azərbaycan Respublikasının 1991-ci il oktyabrın 18-də imzalanan konstitusiya akt ilə özünün müstəqilliyini yenidən bərpa etdiyini vurğulayıb. Bədii hissədə fakültədənin Meh ədəbi dərnəyinin üzvlərindən Cəmilə Məmmədova, Zəhra İskəndərli və İlqar Cabbarov vətənpərvərlik mövzusunda şeirlər, o cümlədən, tanınmış şairə Mahirə Nağıqızının, "Salam olsun", "Vətən, ay, Vətən", "Sərhəd qapısı " kimi şeirlərini ifa ediblər. Daha sonra isə ADPU-da təhsil alan Türkiyə və Pakistandan olan əcnəbi tələbələr Aezrbaycanın Müstəqilliyin Bərpası Gününə həsr elədikləri Azərbaycan dilində bədii kompozisiya ilə çıxış edib, "Qarabağ Azərbaycandır!" nidasını səsləndiriblər. ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru profe. Mahirə Hüseynova iştirakçılara minnətdarlığını bildirərək, xüsusən əcnəbi tələbələrin Azərbaycan dili və mədəniyyətini yaxından mənimsəmələrini olduqca yüksək qiymətləndirib. Sonda əcnəbi tələbələrə Azərbaycan dili üzrə hazırlıq dərsləri keçən müəllim Aynurə Əliyevaya universitet rəhbərliyi və Həmkarlar İttifaqı Komitəsi tərəfindən fəxri fərman və qiymətli hədiyyələr təqdim olunub.

## YAP-IN 30 İLLİYİ MÜNASİBƏTİ İLƏ İCLAS KEÇİRİLİB

Oktyabrın 26-da ADPU-da Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayonu üzrə "Ü.Hacıbəyov 68" Ərazi Partiya Təşkilatının təşkilatçılığı ilə partiyanın yaranmasının 30 illiyinə həsr olunmuş iclas keçirilib.



Əvvəlcə, müstəqil Azərbaycan Respublikasının və YAP-ın qurucusu ümummilli lider Heydər Əliyevin universitetin foyesindəki abidəsi önünə gül dəstələri qoyulub. Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilməsi və Vətən uğrunda canlarını fəda etmiş şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayan iclasda ADPU-nun rektoru professor Cəfər Cəfərov, YAP Səbail rayon Təşkilatının sədri Muxtar Nağıyev və "Ü.Hacıbəyov 68" Ərazi Partiya Təşkilatının sədri Sultanəli Qurbanov çıxış edərək Yeni Azərbaycan Partiyasının keçdiyi tarixi inkişaf yoluna nəzər salaraq YAP-ın müasir Azərbaycan dövlətinin inkişafında müstəsna rolunu qeyd etmişlər. Natiqlər ümummilli lider Heydər Əliyevin uzaqgörənliyi nəticəsində yaranan partiyanın cəmiyyət həyatının bütün sahələrində müsbət fəaliyyətini xüsusilə qeyd etmişlər. Tədbir iştirakçılarına partiyanın tarixini əks etdirən videoçarx nümayiş olunduqdan sonra YAP-ın "qızıl fondu"nu təşkil edən "91-lər"in nümayəndələrindən professor Hacan Hacıyev və dosent Allahverdi Hacıyev ötən əsrin 90-cı illərində yaranmış çətin ictimai-siyasi vəziyyət fonunda Yeni Azərbaycan Partiyasının təsis edilməsi zərurətindən və bu zaman qarşıya çıxan çətinliklərdən söz açmışlar. İclasın sonunda Ərazi Partiya Təşkilatının fəalları fəxri fərman və təşəkkürnamələrlə təltif olunub və Partiyaya yeni üzv olan gənclərə üzvlük vəsiqələri təqdim olunub.

## NURLAN İSMAYILBƏYLİ ADPU "SABAH MAGİSTRATURA" TƏLƏBƏLƏRİ İLƏ GÖRÜŞÜB



ADPU-nun Strateji inkişaf məsələləri üzrə prorektorluğunun dəvəti ilə Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin İnsan Resursları Mərkəzinin direktoru Nurlan İsmayılbəylinin ADPU "SABAH magistratura" proqramı çərçivəsində "Təlim və tədrisin təşkili və metodikası" ixtisaslaşmasında təhsil alan tələbələrlə görüşü təşkil olunub.

"Müəllim hazırlığı və işə qəbulu siyasəti: yerli və xarici təcrübənin müqayisəsi" mövzusunda görüşün əvvəlində tələbələr Sinqapur, Finlandiya, Yaponiya, Qazaxıstan, Türkiyə və s. ölkələrdə müəllimlərin işə qəbul siyasəti barədə çıxış ediblər. Daha sonra qonaq spiker tələbələri ARTİ-nin İnsan resursları mərkəzinin fəaliyyət istiqamətləri, ilk dəfə məhz bu mərkəzdə həyata keçirilən qarşılıqlı yerdəyişmə müsabiqəsi, sertifikatlaşdırma prosesi, rəqəmsal bacarıqlar layihəsi, məktəbəqədər müəssisələrdə işə qəbul və s kimi məsələlərin statistikası və onların təhlilini tələbələrin diqqətinə çatdırıb.

## OYUNCAQ VƏ CİZGİ FİLMLƏRİNƏ AİD TƏLƏBƏ KONFRANSI, KUKLA TEATRI, OYUNCAQ SƏRGİSİ



ADPU-nun Şəki filialında Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri, baş müəllim Səadət Feyzullayevanın təşkilatçılığı ilə maraqlı layihə həyata keçirilib. Layihə çərçivəsində "Cizgi filmləri və nağılların 3-5 yaşlı uşaqların inkişafında rolu" mövzusunda tələbə elmi-praktik konfransı təşkil edilib. Filialın müəllim və tələbələrinin iştirak etdiyi konfransı elmi işlər üzrə direktor müavini p.ü.f.d., dos. Nurəli Çələbiyev giriş sözü ilə açaraq, qoyulmuş mövzunun aktuallığını qeyd edib. N.Çələbiyev cizgi filmləri və nağılların psixoloji tərəflərinin elmi əsaslarla, yaşa müvafiq qaydada seçilməsinin vacibliyini konfrans iştirakçılarının diqqətinə çatdırıb.

S.Feyzullayeva cizgi filmləri, nağıl qəhrəmanları və oyuncaqlara verilən müasir tələblərdən danışıb, onların uşaqların təfəkkürünün, sosial intellektinin formalaşmasında böyük rola malik olduğunu qeyd edib.

Sonra "Məktəbəqədər təlim və tərbiyə" ixtisasının tələbələri, - Rəvanə Bayramovanın ""Tıq-tıq xanım" nağılının müasir baxışdan təhlili", Aişəgül Pirimovanın "Cizgi filmlərinin 3-5 yaşlı uşaqların inkişafına təsiri", Səbinə Mustafabəylinin "Uşaqların inkişafında əmək tərbiyəsinin və yaradıcılıq işlərinin rolu", Fəridə Hüseynovanın "Kukla teatrı", Fərqanə Hacı-Xəlilovanın "Oyuncaqlar" mövzusunda - çıxışları dinlənilib. Çıxışlar başa çatdıqdan sonra həmin ixtisasın tələbələri oyuncaqların müxtəlif texnikalarla hazırlanma qaydalarını nümayiş etdiriblər. Konfrans başa çatdıqdan sonra layihənin davamı olaraq, filialın "Məktəbəqədər təlim və tərbiyə" ixtisasının tələbələri tərəfindən hazırlanan "Şəngülüm, şüngülüm, məngülüm" kukla teatrı nümayiş etdirilib. Qeyd edək ki, bu, filialın tarixində ilk dəfə olaraq təşkil edilib.

Layihə çərçivəsində təşkil olunan "İkici həyat" - oyuncaqlar sərgisi böyük marağa səbəb olub. Sərgi noyabrın 1-nə kimi davam edib. Sərgiyə ən yaxşı iş təqdim edən tələbələr mükafatlandırılıb. Kukla teatrı və sərginin videoyazısı filialın yutub kanalında yerləşdiriləcək.

## AİLƏ SAĞLAMLIĞI İLƏ BAĞLI GÖRÜŞ



Noyabrın 3-də ADPU-da "Sağlam ailə sağlam cəmiyyətin, güclü dövlətin özülüdür" mövzusunda görüş keçirilib. Eyniadlı layihə əsasında keçirilən görüşdə ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov, Azərbaycan Respublikası Milli Məclisinin deputatları Elman Nəsirov, Vüqar İskəndərov, Naqif Həmzəyev və Müşfiq Cəfərov, "Xalq" qəzetinin baş redaktoru Əflatun Amaşov, Əməkdar jurnalist Azər Həsrət, beynəlxalq ekspert Vəli Əlibəyov, "Kimsəsiz Uşaqların Sosial Müdafiəsi" İctimai Birliyinin sədri, layihə rəhbəri Lamiyə İsazadə, QHT nümayəndələri və tələbələr iştirak ediblər. Tədbirdən əvvəl qonaqlar ADPU-nun rektoru professor Cəfər Cəfərovla görüşüb, Universitetdə görülən işlərlə yaxından tanış olublar. Görüşdə layihə çərçivəsində hazırlanan məlumat kitabçası iştirakçılara təqdim olunub və spikerlər tərəfindən ailə dəyərləri ilə bağlı çıxışlar edilib, tələbələrlə fikir mübadiləsi aparılıb.

## AZƏRBAYCAN MAARİFÇİLİYİNDƏ ŞUŞA ŞƏHƏRİNİN ROLU

Noyabrın 3-də Tarix və coğrafiya fakültəsində Azərbaycan tarixi kafedrasının təşkilatçılığı ilə "Azərbaycan maarifçiliyində Şuşa şəhərinin rolu" adlı elmi-praktik konfrans keçirildi. Universitetin rektoru prof. Cəfər Cəfərov konfransı giriş sözü ilə açaraq, 8 Noyabr – Zəfər günü və 9 Noyabr - Dövlət Bayrağı Günü münasibəti ilə iştirakçıları təbrik etdi. Prof. C.Cəfərov qeyd etdi ki, tarixən Azərbaycanın mədəniyyət mərkəzlərindən olan Şuşa şəhəri ilə bağlı bu tipli konfransların keçirilməsi olduqca əhəmiyyətli və təqdirəlayiqdir.



Konfransda Azərbaycan tarixi kafedrasının müdiri dos. N.Əhmədova "Şuşa şəhəri Azərbaycanda dünyəvi təhsilin mərkəzi kimi" adlı məruzə ilə çıxış edərək, Şuşa şəhərində dünyəvi təhsil sistemi, Azərbaycanda dünyəvi təhsilin inkişafında Şuşa şəhərinin yeri və əhəmiyyəti kimi məsələləri tədbir iştirakçılarının diqqətinə çatdırdı. Məruzəçilərdən prof. C.Mustafayev "Şuşa şəhəri: tarix və müasirlik", dos. Z.Kərimov "Şuşa maarif məktəbinin yetirdiyi ictimai siyasi xadimlər", dos. E.Süleymanova "Orta əsrlərdə Alban xristian maarifçiliyi və Şuşa şəhəri", dos. M.Ağalarlı isə "Azərbaycanın maarifçilik ənənələri və Şuşa şəhəri" adlı elmi məruzələrlə çıxış etdilər.

## NARKOMANİYAYA QARŞI MÜBARİZƏYƏ DAİR GÖRÜŞ



Noyabrın 10-da ADPU Könüllüləri Təşkilatı tərəfindən "Ağ ölüm - narkomaniya ilə mübarizə" mövzusunda tədbir keçirilib. Tədbirdə ekspert qismində Dövlət Gömrük Komitəsi Tibbi Xidməti İdarəsinin Elmi-tədrübi və Tədris Mərkəzinin mütəxəssisi Şəhla Mirzəzadə iştirak etmişdir. Tədbiri giriş sözü ilə açan təşkilatın sədri İsmayıl Nəsirov müasir cəmiyyətimizin ən aktual problemlərindən biri olan narkomaniya ilə mübarizəyə dair universitetdə mütəmadi şəkildə maarifləndirmə tədbirlərinin keçirildiyini vurğulamışdır. Daha sonra çıxış edən ekspert Ş.Mirzəzadə narkomaniyanın insanlara vurduğu fiziki, psixi və mənəvi zərərlərinin uzun müddət qalıcı olduğunu vurğulamış, ümumilikdə yaranan bu asılılığın məhvə apardığını bildirmişdir. Ölkəmizdə narkomaniya ilə mübarizə tədbirlərinin geniş miqyasda həyata keçirildiyini qeyd edən mütəxəssis tələbə-gəncləri, xüsusən, pedaqoqları bu maarifləndirmə işlərinin bilavasitə iştirakçısı və təşkilatçısı olmağa dəvət etmişdir.

## TƏLƏBƏLƏR ŞƏHİD ÖVLADLARI İLƏ BİR ARADA



ADPU SABAH qrupları tələbələrinin təşkilatçılığı ilə Zəfəri bizə qazandıraraq, şəhidlik zirvəsinə ucalan igidlərimizin övladları ilə görüş keçirilmişdir. Görüşdə şəhid, qazi övladları ilə vaxt keçirən tələbələrimiz birlikdə müxtəlif oyunlar oynamış, onlarla həmsöhbət olmuşlar. Görüş həm tələbələrin, həm də qəhrəmanlarımızın əmanətlərinin xoş təəssüratları ilə yadda qalmışdır.

## ŞƏHİD TURQUT XƏLİLBƏYLİNİN AİLƏSİ ZİYARƏT OLUNUB

ADPU Könüllüləri Təşkilatının fəalları (AKT) Vətən müharibəsi şəhidi Turqut Xəlilbəylinin ailəsi ziyarət olunub. Şəhidin ailə üzvləri tərəfindən tələbələrə Turqutun keçdiyi şərəfli döyüş yolu və xatirələrindən bəhs edilib, onun Vətənə olan məhəbbətinin tükənməzliyi vurğulanıb. Daha sonra tələbələrin iştirakı ilə şəhidin xatirə bulağı ziyarət olunub.



Azərbaycan Ordusunun leytenantı olan hərbi tibb qulluqçusu Turqut Xəlilbəyli 2020-ci il sentyabrın 27-də başlanan Vətən müharibəsi zamanı Füzulinin və Cəbrayılın azadlığı uğrunda gedən döyüşlərdə yaralanan hərbçilərə yerindəcə yardım etmiş, xidməti vəzifəsini yerinə yetirərkən şəhidlik zirvəsinə ucalmışdır. Şəhid olandan sonra sonra "Vətən uğrunda" medalı və "Azərbaycan Bayrağı" ordeni ilə təltif olunub.

## COĞRAFİYAÇI ALİMİN QARABAĞ ÇAYLARI İLƏ BAĞLI ELMİ SEMİNARI



Noyabrın 17-də Tarix və coğrafiya fakültəsində "Qarabağ və Şərqi Zəngəzur çaylarının hidroekoloji vəziyyətinin qiymətləndirilməsi" mövzusunda elmi seminar keçirilib. Fakültə rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak etdiyi elmi seminarda Ümumi coğrafiya kafedrasının müdiri, coğrafiya elmləri doktoru, tanınmış hidroloq alim Məhəmməd Abduyevin məruzəsi dinlənilib. Qeyd edək ki, elmi seminar cari ilin "Şuşa ili" kimi qeyd olunması, həmçinin işğalda azad olunan ərazilərin "Yaşıl zona" elan edilməsi ilə bağlı xüsusi aktuallığı ilə seçilir. Seminarın sonunda dosent Mətanət Əsgərova məruzə ilə bağlı öz fikirlərini bölüşüb, müəllim və tələbələrin sualları cavablandırılıb.

## 6 DİLDƏ NƏŞR EDİLƏN MONOQRAFİYA




ADPU-nun Ümumi pedaqogika kafedrasının dosenti, fəlsəfə elmləri doktoru Müslüm Nəzərovun "Socio-cultural problems of education in the modern period" ("Müasir dövrdə təhsilin sosial-mədəni problemləri") adlı monoqrafiyası Almaniyanın "LAP LAMBERT Academic Publishing" nəşriyyatı tərəfindən ingilis, alman, fransız, italyan, portuqal və rus dillərində nəşr olunub. Monoqrafiyada postsənaye cəmiyyətin ümumi səciyyəsindən, informasiya cəmiyyətində təhsilin başlıca inkişaf istiqamətlərindən, qloballaşma və modernləşmə proseslərindən, informasiya mədəniyyəti və təhsil islahatlarının sosiomədəni amillərindən, Azərbaycan təhsilinin sosiomədəni ənənələrindən, Avropa təhsil məkanına inteqrasiya kontekstində Azərbaycan təhsilinin modernləşməsinin sosiomədəni problemlərindən, Boloniya prosesi konsepsiyasının həyata keçirilməsinin milli-mədəni xüsusiyyətləri və perspektivlərindən bəhs edilir. Monoqrafiya müəllimlər, magistrantlar, doktorantlar, tədqiqatçılar üçün nəzərdə tutulmuşdur. Xatırladırıq ki, müəllifin "Sociocultural Fundamentals of Education" ("Təhsilin sosiomədəni əsasları") adlı monqrafiyası 2020-ci ildə "LAP LAMBERT Academic Publishing" nəşriyyatı tərəfindən ingilis dilində çap edilmiş, 2021-ci ildə isə Latın Amerikası, Rusiya və Avropanın 10 dilinə tərcümə olunaraq oxuculara təqdim olunub.

## AGMA İLƏ GÖRÜŞ KEÇİRİLİB



ADPU Təhsil Könüllüləri İctimai Birliyinin (ADPU TKİB) təşkilatçılığı ilə Azərbaycan Gənc Müəllimlər Assosiasiyası (AGMA) ilə tələbələrin görüşü keçirilib.

Görüş zamanı AGMA-nın gənc müəllimlər üçün yaratdığı geniş fəaliyyət istiqamətləri barədə məlumat verilmişdir. Çıxış edən AGMA-nın sədri Rüfət Əsədzadə tələbələrə "Tələbə, məzun yox, təcrübəli məzun" mövzusunda təlim keçib. Görüşdə "gencmuellim.az" platformasının əhəmiyyəti barədə ətraflı məlumat verilmiş və bildirilmişdir ki, platforma müəllimlərə davamlı öyrənmə imkanları yaradır. Hazırda platformada 3500-dən çox aktiv müəllim və 18 müxtəlif kurs mövcuddur.

## YENİ KİTABLARIN SƏRGİSİ



Noyabrın 18-də ADPU-nun Kitabxana-İnformasiya Mərkəzində yeni alınmış kitabların sərgisinin açılışı olub. Sərgidə ADPU-nun rektoru professor Cəfər Cəfərov, universitetin prorektorları, fakültə dekanları, kafedra müdirləri, struktur rəhbərləri və professor-müəllim heyəti iştirak edib. Rektor bildirib ki, Universitetdə aparılan sürətli yenilənmə işləri içərisində kitabxana fondunun dünya elmi-pedaqoji fikrinin nəzərə alınaraq, müasir trendlərə uyğun şəkildə ən son ədəbiyyatlarla təchizi, xidmət infrastrukturunun yenilənməsi və elektron xidmətlərin təkmilləşdirilməsi əsas istiqamətlərdən biridir. Bu baxımdan son illər xarici dillərdə nəşr olunan təhsil tədqiqatları, təhsil menecmenti, psixologiyası, təlim metodlarına dair elmi əsərlərin alınması və tərcüməsi universitet rəhbərliyi tərəfindən diqqətdə saxlanılır. Bu dəfə isə Türkiyədə nəşr olunan 74 adda ən son tədqiqat və digər dillərdən tərcümə əsərlər alınaraq universitetin akademik və tələbə heyətinin ixtiyarına verilib. Sərgi ilə tanışlıqdan sonra rektor və akademik heyət universitetin kitabxanası və inzibati binasında aparılan təmir-yenidənqurma işlərinin cari vəziyyəti ilə tanış olublar.

## "GƏLƏCƏYİN ƏN YAXŞI MÜƏLLİMİ"



ADPU Təhsil Könüllüləri İctimai Birliyinin (ADPU TKİB) təşkilatçılığı ilə keçirilən tələbələr arasında "Gələcəyin ən yaxşı müəllimi" müsabiqəyəsinə start verilib. Layihə çərçivəsində universitetin fakültələrində müxtəlif ixtisaslar üzrə təhsil alan tələbələr arasından seçilən namizədlər açıq dərs formatında interaktiv təlim üsulları ilə dərslər keçirlər. Hər bir fakültədə metodist alimlərdən ibarət münsiflər heyəti dərsləri müşahidə edərək qiymətləndirir.

Layihənin məqsədi tələbələrin pedaqoji təcrübə və müəllimlik fəaliyyətinə başlamalarına, bilik və bacarıqlarla yanaşı, məzmunu çatdırmaq, effektiv qarşılıqlı ünsiyyət və auditoriyanı idarə etmək keyfiyyətlərinin inkişafına dəstək verməkdir.

Layihənin ilk mərhələsi ADPU-nun Tarix və coğrafiya fakültəsində keçirilib. Əvvəlcə fakültə dekanı dosent Asif Axundov və ADPU TKİB sədri Nərgiz Quluzadə çıxış edərək layihənin əhəmiyyətindən söz açmış və iştirakçılara uğurlar arzulayıblar. Fakültədə layihəyə müraciət edənlər arasından seçim mərhələsini uğurla keçmiş 6 tələbə hazırladıqları açıq dərs təqdimatlarını nümayiş etdirmiş və professor-müəllim heyəti tərəfindən dərslərin qiymətləndirilməsi aparılmışdır. Müəllim və tələbələr tərəfindən böyük maraqla qarşılanan layihədə fakültə üzrə ən çox bal toplayan tələbə Limunət Cəfərova diplomla mükafatlandırılıb.

## "ŞUŞA – ZƏFƏRİN TƏNTƏNƏSİ" KİTABININ TƏQDİMATI

Noyabrın 24-də Filologiya fakültəsində "Şuşa ili" münasibətilə hazırlanan "Şuşa - Zəfərin təntənəsi" kitabının təqdimat mərasimi keçirilib. Əsərin ideya müəllifi professor Mahirə Hüseynova, müəllifləri isə fakültənin dekan müavini, fil.ü.f.d. Könül Həsənova və Ədəbiyyatın tədrisi texnologiyası kafedrasının müdiri dosent Nazilə Abdullazadədir. "Şuşa - Zəfərin təntənəsi" kitabında Azərbaycan, rus və ingilis dillərində Şuşa şəhərinin yaranması, tarixi, Şuşa toponiminin xalq ədəbiyyatı nümunələrində, yazılı ədəbiyyatda yeri, Şuşanın işğal dövrü, Şuşanın məktəbşünaslıq tarixi, musiqisi, ədibləri, həmçinin Şuşa ədəbi mühitinin qadın şairləri, şuşalı ziyalı şəxsiyyətlər haqqında araşdırmalara geniş yer verilmişdir. Həmçinin, kitabın səciyyəvi xüsusiyyətlərindən biri də əsərdə arxivlərdən toplanmış şuşalı şair və ədiblərin, mədəniyyət və incəsənət xadimlərinin, musiqiçilərin fotoşəkillərinin verilməsidir. Bütün bunlar bir daha sübut edir ki, Şuşa təhsil tariximizin, mədəniyyətimizin beşiyidir.



ADPU rəhbərliyi və Filologiya fakültəsinin müəllim-professor heyətinin iştirakı ilə baş tutan təqdimat mərasimində açılış nitqi ilə çıxış edən Beynəlxalq əlaqələr üzrə prorektor, Filologiya fakültəsinin dekan vəzifəsini icra edən prof. M.Hüseynova müəllifləri təbrik edərək kitabın nəşrinin Azərbaycan elmi ictimaiyyəti üçün önəmli bir hadisə olduğunu vurğulayıb. M.Hüseynova qeyd edib ki, Şuşa zəfəri Azərbaycan xalqının təntənəsi, qürur yeridir. Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov əsər haqqında danışaraq deyib: "44 günlük Vətən müharibəsi, eləcə də Şuşa zəfəri Azərbaycan xalqının və dövlətçiliyinin özünütəsdiqi, bütün dünyaya verməli olduğu birbaşa mesajdır. İndi isə əsas vəzifəmiz bütün dünyaya bu zəfəri anbaan çatdırmaqdır. Bu kitab da məhz bu nöqteyi-nəzərdən çox böyük əhəmiyyət daşıyır." Tədbirdə Filologiya fakültəsinin müəllimləri ingilis, rus və fransız dillərində çıxış edərək kitab haqqında geniş məlumat vermişlər.

Tədbir "Meh" ədəbi dərnəyinin üzvlərinin təqdimatında ədəbi hissə ilə davam etdirilib və əməkdar artist Elnur Zeynalovun ifasında Mahirə Nağıqızının "Görünür" şeirinə bəstələnmiş mahnının ifa olunması ilə yekunlaşıb.

## BEYNƏLXALQ TƏLİM KURSU YEKUNLAŞIB



ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Təlim-Tədris Mərkəzinin təşkilatçılığı ilə Yamayka və Karib hövzəsi regional institutlarında media dərəcəsini bitirmiş, Londonda nüfuzlu UCL IOE-də magistr dərəcəsi və Honq Konq Universitetinin Təhsil fakültəsində PhD dərəcəsi almış təlimçi Dr. Nadine Muschette tərəfindən 3 aylıq "Tədqiqat məqalələrinin yazılması və nəşri" mövzusunda təlim keçirilmişdir. Təlimdə ADPU-nun professor-müəllim heyəti iştirak etmişdir.

Təlimin əsas mahiyyəti praktiki təlim və tədqiqat məqalələrinin yazılması və resenziyalı jurnallarda dərc olunması üçün iştirakçılara dəstək vermək, tədqiqat məqaləsinin hər bir bölməsi haqqında anlayışlarını gücləndirmək üçün AIMRDC (Abstrakt, Giriş, Metodologiya, Nəticələr, Müzakirə, Nəticə) məqalə strukturu ilə tanış olmaqdır.

Təlimin sonunda qiymətləndirmə üçün müdavimlər təlimçiyə məqalə təqdim edərək uyğun jurnalların seçilməsi ilə bağlı müzakirələr aparıblar.

## MAŞTAĞA MƏKTƏBLİLƏRİ PEDAQOJİ UNİVERSİTETDƏ MARAQLI ANLAR YAŞADI



Noyabrın 24-də Sabunçu rayonu Maştağa kənd 209 nömrəli tam orta məktəbin VIII-IX siniflərində təhsil alan 35 nəfər şagirdi ADPU-nun qonağı olublar. Görüş Gəncə Regional Qadın Mərkəzi İctimai Birliyinin (GRQM İB) ""Gender məktəbi" çərçivəsində fəaliyyətlərin təşkili" layihəsi çərçivəsində həyata keçirilib. Layihənin məqsədi məktəblərdə gender bərabərliyinin təşviqi ilə tolerant, tənqidi düşüncəyə malik, təşəbbüskar və SMART yeni nəslin yetişdirilməsinə töhfə verməkdir. Əvvəlcə şagirdlərlə ADPU-nun böyük akt zalında görüş keçirilib. Görüşdə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva, Bakı şəhəri üzrə Baş Təhsil İdarəsinin müdiri Məhəbbət Vəliyeva, Elm və Təhsil Nazirliyi yanında İctimai Şuranın sədri Günel Səfərova, GRQM İB-nin sədri Məleykə Əlizadə, 209 nömrəli tam orta məktəbin direktoru Səbahət Ağayeva, həmçinin məktəbin müəllimləri, şagirdlər və valideynlər iştirak ediblər.

Spikerlər çıxış edərək təhsildə gender bərabərliyinin təşviqinin əhəmiyyətindən söz açmış, xüsusən, genderə həssas bölgələrdə ictimai maarifləndirmə işlərinin vacibliyini vurğulamışlar. Çıxışlarda bu baxımdan yuxarı sinif şagirdlərinin ali təhsil müəssisələrinə səfərlərinin, görüşlərinin də onların dünyagörüşü və peşə-ixtisas seçimində rolu xüsusi vurğulanmışdır. O da qeyd olunub ki, məktəb-icma birliyinin yaradılması konsepsiyası çərçivəsində bu səfər valideynlərlə ortaq təşkil edilib. Görüş zamanı ADPU-nun tələbə təşkilatlarının fəalları tərəfindən şagirdlərə dəstək vermək məqsədi ilə mentorluq proqramının icra olunması qərara alınıb. Daha sonra şagirdlər universitetlə ətraflı tanış olmuşlar. Universitetin Heydər Əliyev Muzeyi, "Zəfər" stendi, STEAM Mərkəzi, müasir Kitabxana-İnformasiya Mərkəzi, tədris auditoriyalarını gəzən şagirdlər çay süfrəsi ətrafında təəssüratlarını bölüşmüşlər. ADPU-nun rektoru professor Cəfər Cəfərov şagirdlərlə görüşərək səmimi söhbət edib. Şagirdlərin əksəriyyəti gələcəkdə müəllimlik peşəsinə yiyələnmək arzularını ifadə etmişlər. Şagirdlərə və 209 nömrəli məktəbə ADPU-nun 100 illik yubiley nəşrləri və suvenirləri, həmçinin ingilis dilində bədii kitablar hədiyyə olunub. Qeyd edək ki, layihə çərçivəsində digər Bakıətrafı kənd məktəblərinin də şagirdlərinin universitetə ekskursiyası təşkil olunacaq.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## ADPU-DA OBYEKT VƏ HEYƏTİN MÜHAFİZƏSİ



ADPU-da inzibati binaların və müəllim-tələbə heyətinin mühafizəsinin təşkili, təhlükəsiz təlim mühiti tam təmin edilir. Mühafizə xidməti ilə bağlı işin sistemliliyinin və mərkəzi mühafizə xidmətinin təşkili məqsədi ilə ADPU ilə GESCO ASC ixtisaslaşmış özəl mühafizə şirkəti ilə müqavilə imzalanmışdır. GESCO ASC 17 illik yerli və beynəlxalq təcrübəyə əsaslanan, personal, bina və qurğuların fiziki mühafizənin təmin edilməsi prinsipini rəhbər tutaraq, müxtəlif istiqamətlər üzrə fəaliyyət göstərən mühafizə şirkətidir. Şirkət mühafizə xidmətini İSO 9001, İSO 14001, İSO 45001 keyfiyyət standartlarının tələblərinə uyğun həyata keçirir.

Ən müasir texnologiya və imkanları öz xidmətlərinə inteqrasiya edən GESCO, beynəlxalq təcrübə və keyfiyyət standartları ilə yerli, peşəkar xidməti birləşdirərək ADPU-nun Bakı şəhərində yerləşən tədbir binalarında 24 saat fasiləsiz mühafizəni, tədris və inzibati sahələrdə nəzarət-buraxılış xidmətini həyata keçirir.

ADPU üzrə mühafizə xidmətinin rəisi Hacı Nəsirovun rəhbərliyi ilə gecə və gündüz növbələri olmaqla ümumilikdə 30 nəfərdən ibarət personal ayıq-sayıq qorunmanı təmin edirlər.

ADPU-nun əsas tədris binasında mühafizəçilər Ağali Bayramov, Murad Spirin və İlkin Kərimovla yanaşı xanım əməkdaş Bədürə Abdullayeva da tələbə və müəllimlərə xidmət göstərir. Peşəkar mühafizəçilər, həmçinin, universitetdə kütləvi tədbirlərin təşkili, vətəndaş müraciətlərinin aidiyyəti üzrə operativ yönləndirilməsində də yaxından iştirak edirlər.

## ÜMUMİ ŞÖBƏ




Təşkilati struktur kimi rektorluğun tərkibinə aid olan Ümumi şöbə 1921-ci ildə dəftərxana adı ilə fəaliyyətə başlamışdır. 2016-cı ildə universitetdə struktur dəyişikliyi ilə əlaqədar olaraq dəftərxana ümumi şöbə adlandırılmışdır.

Ümumi şöbə universitetin digər struktur bölmələrinin fəaliyyəti ilə bağlı kargüzarlıq, sənəd dövriyyəsi, arxiv, vətəndaşların qəbulu və onların müraciətlərinə baxılması sahəsində işlərin təşkilini və tənzimlənməsini həyata keçirir. Universitetə daxil olan müraciətləri qəbul edir, qeydiyyata alır, sənədlərin surətlərini və rəhbərliyin göstərişini aidiyyatı qurumlara çatdırır, ADPU-dan digər təşkilat, qurum və vətəndaşlara göndərilən sənədlərin ünvanlarına vaxtında çatdırılmasını təmin edir.

1973-1982-ci illərdə şöbə müdiri vəzifəsində Nailə Bayramova çalışmışdır. 1982-ci ildən şöbəyə Xuraman Əliyeva rəhbərlik edir. Ümumi şöbədə 11 nəfər: müdir Xuraman Əliyeva, baş mütəxəssis Əlövsət Hümbətov, mütəxəssislar Nigar Ələkbərova, Sevil Xəlilova, Tükəzban Mustafayeva, kargüzar Aygün Yusifova, operatorlar Rəbiyyə Məmmədova, Pərvanə Qasımova, Leyla Həsənova, Jalə Quliyeva və kuryer Elnarə Qocayeva çalışır.

***Məlumatlar "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921-2021). II cild" kitabına əsaslanaraq hazırlanıb.***

## BAŞSAĞLIĞI



Ənvər İmanov

Tədris departamentinin direktor müavini, dosent



Kamandar Cəfərov

Riyazi analiz kafedrasının dosenti



Şükür Əlizadə

Fizikanın tədrisi texnologiyası kafedrasının professoru, Əməkdar müəllim



Cəmilə Bəhmənova

Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının baş müəllimi

Azərbaycan Dövlət Pedaqoji Universitetinin rəhbərliyi, professor-müəllim heyəti, tələbələri və əməkdaşları mərhum pedaqoqlarımıza Allahdan rəhmət diləyir, yaxınlarına səbr arzulayır!

Onların xatirəsi qəlbimizdə daim yaşayacaq!

Allah rəhmət eləsin !



*Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 3557*

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.